# İMAM CƏFƏR SADİQ ƏLEYHİSSƏLAMIN HƏYATI

:Müəllif

Mehdi Pişvayi

:Çap nəşriyyat

Şəhriyar

:Digital nəşriyyat

İsfəhan Qaimiyyə adına komputer araşdırmalar mərkəzi

# Mündəricat

# İMAM CƏFƏR SADİQ ƏLEYHİSSƏLAMIN HƏYATI

## Kitab haqqında

Kitabın adı:İmam Cəfər Sadiq əleyhissəlamın həyatı

Müəllif:Mehdi Pişvayi

:Naşir

:Çap tarixi

Səhifələrin sayı:۳۶

Çap növbəsi:Birinci

Tirajı:۳۰۰۰

səh:۱

## İşarə



## İmam Sadiq əleyhissəlamın həyatı barədə qısa məlumat

Altıncı İmamın adı Cəfər, künyəsi Əbu-Abdullah, ləqəbi Sadiq, atası İmam Baqir .(əleyhissəlam), anası isə Ümmü-Fərvə olmuşdur

İmam Sadiq (əleyhissəlam) hicrətin səksən üçüncü ilində rəbiül-əvvəl ayının on yeddisi Mədinə şəhərində dünyaya gəlmiş, hicrətin yüz qırx səkkizinci ili altmış beş yaşında vəfat etmişdir. Müqəddəs məzarı Bəqi qəbiristanlığında atasının məzarı kənarındadır.

## İmam Sadiq əleyhissəlamın müasiri olmuş xəlifələr

İmam Sadiq (əleyhissəlam) hicrətin yüz on dördüncü ilində İmamətə yetişmişdir. O Həzrətin İmamət dövrü hicrətin yüz otuz ikinci ilində başa çatmış və bu dövr Əməvilər hakimiyyətinin sonları və Abbasilər sülaləsinin əvvəllərinə təsadüf edir.

İmam Sadiq (əleyhissəlam) adları aşağıda çəkilən Əməvi xəlifələrini müasiri olmuşdur:

Hişam ibn Əbdülməlik (١٠٥-١٢٥ h.q);

Vəlid ibn Yezid ibn Əbdülməlik (١٢٥-١٢۶ h.q);

Yezid ibn Vəlid ibn Əbdülməlik (١٢۶ h.q);

İbrahim ibn Vəlid ibn Əbdülməlik (hicrətin yüz iyirmi altıncı ilinin cəmi yetmiş gününü);

Mərvan ibn Məhəmməd (Mərvani Himar) (١٢۶-١٣٢ h.q);

Abbasi xəlifələrindən isə aşağıdakıların müasiri olmuşdur:

Abdullah ibn Məhəmməd (Səffah) (١٣٢-١٣٧ h.q);

Əbu-Cəfər (Mənsur Dəvaniqi) (١٣٧-١۵٨ h.q);

## İmam Sadiq əleyhissəlamın elmi səviyyəsi

İmam Sadiq əleyhissəlamın elmi əzəmət və yüksəkliyinə aid çoxlu sübutlar vardır. Bu məsələ həm şiə, həm də sünni alimlərinin qəbul etdiyi bir mövzudur. Böyük alim və fəqihlər onun elm mərtəbəsinin yüksəkliyi qarşısında diz çökür, onun elm sahəsində üstün olduğunu tərifləyirlər.

Hənəfi firqəsinin məşhur banisi Əbu-Hənifə deyirdi: "Mən Cəfər ibn Məhəmməd əleyhissəlamdan (İmam Sadiqdən) savadlı şəxs görməmişəm."(١) O həmçinin, deyirdi: "Mənsur (Dəvaniqi) Cəfər ibn Məhəmməd əleyhissəlamı hüzuruna çağıran zaman məni çağırıb dedi: "Camaat Cəfər ibn Məhəmmədin vurğunu olmuşdur, onu məhkum etmək üçün bir sıra çətin məsələləri nəzərində tut." Mən qırx dənə çətin məsələ hazırladım. Bir gün Mənsur Hiyrədə olarkən məni çağırtdırdı. Məclisə girərkən gördüm ki, Cəfər ibn Məhəmməd (əleyhissəlam) (İmam Sadiq) onun sağında oturub. Ona baxdıqda heybəti məni elə bürüdü ki, heç Mənsuru görəndə elə olmurdum. Salam verib Mənsurun işarəsindən sonra oturdum. Mənsur üzünü ona (İmam Sadiq əleyhissəlama) tutub dedi: "Bu, Əbu-Hənifədir." O cavab verdi ki, tanıyıram. Sonra Mənsur üzünü mənə tutub dedi: "Ey Əbu-Hənifə! Öz məsələlərini Əbu-Abdullah (İmam Sadiq (əleyhissəlam)) ilə müzakirəyə qoy." Mən də məsələləri deməyə başladım. Hər hansı məsələni soruşurdumsa, dərhal cavab verirdi ki, sizin bu məsələ barədə əqidəniz filan, Mədinə əhalisinin əqidəsi filan, bizim əqidəmiz də filandır. Bəzi məsələlərdə bizimlə həmfikir olur, bəzilərində Mədinə əhalisi ilə, bəzilərində isə fikri tamam başqa olurdu. Bu minvalla düz qırx məsələ soruşdum ki, hamısına cavab verdi." Əbu-Hənifə bura yetişəndə İmam Sadiq əleyhissəlama işarə edərək dedi: "O, insanların ən alimi, onların fiqhi məsələlərə aid olan ixtilaflarını bilən ən agah adamdır."(٢)

Maliki məzhəbinin banisi Malik deyirdi: "Bir müddət Cəfər ibn Məhəmməd əleyhissəlamın yanına gedib-gəlirdim. Onu daima bu üç halda gördüm: ya namaz qılırdı, ya oruc tuturdu, ya da Quran oxuyurdu. Onu dəstəmazsız hədis danışan görmədim.(٣) Elm, ibadət və təqvada Cəfər ibn Məhəmməd əleyhissəlamdan üstün bir şəxsi nə bir göz görmüş, nə bir qulaq eşitmiş, nə də heç kimin fikrinə belə gəlməmişdir."(۴)

Şeyx Müfid yazır: "O Həzrətdən o qədər elm söylənilib ki, artıq bütün müsəlmanların yanında məşhur olmuş, onun səs-sədası hər tərəfə yayılmış, onun nəslindən olanların heç birindən onun söylədiyi qədər elm söylənilməmişdir."(۵)

İbn Həcər Heytəmi yazır: "O Həzrətdən o qədər elm söylənilmişdir ki, artıq bütün müsəlmanların yanında məşhur olmuş, onun səs-sədası hər tərəfə yayılmış və fiqh və

hədis aləminin böyük rəhbərlərindən olan Yəhya ibn Səid, İbn Cərih, Malik, Süfyan Suri, Süfyan ibn Üyeynə, Əbu-Hənifə, Şübə və Əyyub Sicistani kimi şəxslər ondan hədis söyləmişlər.(۶)

Onuncu əsrin görkəmli alimlərindən olan Əbu Bəhr Cahiz deyir: "Cəfər ibn Məhəmməd (əleyhissəlam) elə bir şəxsdir ki, onun elmi bütün dünyanı əhatə etmiş, deyilənlərə görə Əbu-Hənifə və eləcə də, Süfyan Suri onun şagirdlərindən olmuşdur. Bu iki nəfərin onun şagirdi olması onun elmi yüksəkliyini sübut etmək üçün kifayət edər."(۷)

Seyyid Əmir Əli Bəni Üməyyənin hakimiyyəti dövründə mövcud olmuş məzhəbi firqələr və fəlsəfi məktəblərə işarə edərək yazır: "Dini rəy və fitvalar yalnız Əhli-beyt adamlarının yanında özünə fəlsəfi baxım almışdı. O dövrdə elmin yayılması, bəhs və



---

۱- [۱] Təzkirətül-hüffaz, c.۱, səh.۱۶۶.

۲- [۲] Biharül-ənvar, c.۴۷, səh.۲۱۷.

۳- [۳] Təhzibüt-təhzib, c.۱, səh.۸۸.

۴- [۴] Əl-İmamüs-Sadiq vəl məzahibül-ərbəəh, c.۱, səh.۵۳.

۵- [۵] Əl-İrşad, səh.۲۷۰.

۶- [۶] Əs-Səvaiqül-mühriqə, səh.۲۰۱.

۷- [۷] Əl-İmamüs-Sadiq vəl-məzahibül-ərbəə, c.۱, səh.۵۵.

təhqiqat ruhiyyəsi yaratmış və bütün ictimai yerlərdə fəlsəfi söhbətlər əsas yer tutmuşdu. Böyük fəxrlə qeyd etməliyik ki, bu ideoloji hərəkata Mədinədə çiçəklənmiş elm ocağı rəhbərlik edirdi. Bu elm ocağını Əli ibn Əbutalib əleyhissəlamın Sadiq ləqəbli nəvəsi təsis etmişdi. O, fəal təhqiqatçı, böyük mütəfəkkir və dövrün elmlərinə yaxşı bələd olan bir şəxs idi. O, İslamda əsl fəlsəfə üsullu məktəb təsis edən ilk şəxsiyyət olmuşdur. Onun elmi məclislərində sonralardan fiqhi məzhəb baniləri olmuş adamlardan əlavə, uzaq yerdən gəlmiş filosof və fəlsəfə elminin tələbələri də, onun dərslərində iştirak edirdilər. Bəsrə fəlsəfə məktəbinin banisi Həsən Bəsri və Mötəzilə məzhəbinin banisi Vasil ibn Əta da, o Həzrətin şagirdlərindən olmuş, onun elm mənbəyindən bəhrələnmişlər.» (١)

Məşhur tarixçi ibn Xəllikan yazır: "O, on iki İmamlı şiələrin İmamlarından biri, Peyğəmbər ailəsinin böyük şəxsiyyətlərindən biri olmuşdur. Düzgünlüyünə və doğru danışdığına görə onu Sadiq adlandırmışlar. Onun fəzilət və kəraməti o həddədir ki, daha bunu şərh etməyə ehtiyac yoxdur. Əbu-Musa Cabir ibn Həyyan Tərtusi onun şagirdi olmuşdur. Cabir İmam Sadiq əleyhissəlamın təlimlərini ehtiva etmiş və beş yüz risalədən ibarət olan min vərəq həcmində bir kitab yazmışdır. (٢)

### İmam Sadiq əleyhissəlamın dövründəki siyasi, ictimai və mədəni vəziyyət

İmamlar arasında İmam Sadiq əleyhissəlamın dövrü özünəməxsus yer tutmuş və o dövrdəki siyasi-mədəni vəziyyət heç hansı bir İmamın dövründə olmamışdır. Çünki həmin dövr Bəni-Üməyyə hakimiyyətinin zəiflədiyi, Bəni-Abbasın qüdrətinin isə artdığı bir dövr olmuşdur. Bu iki dəstə bu müddətdə bir-biri ilə mübarizədə olmuşdur. Hişam ibn Əbdülməlikin dövründən etibarən Abbasilərin siyasi təbliğatı başlamış, hicrətin yüz iyirmi doqquzuncu ilində bu təbliğat artıq silahlı və nizamlı mübarizəyə çevrilmiş, nəhayət yüz otuz ikinci ildə Abbasilərin qələbəsi ilə nəticələnmişdir. Bu dövrdə Bəni-Üməyyə siyasi çətinliklər içərisində olduğundan daha İmam Sadiq (əleyhissəlam) və şiələrə (İmam Səccad əleyhissəlamın dövründə olduğu kimi) təzyiq göstərməyə fürsət tapmırdı. Abbasilər də hakimiyyətə gəlməzdən qabaq Peyğəmbər ailəsinin tərəfdarı və onların intiqamını almaq şüarı altında hərəkət etdikləri üçün onlar tərəfdən bir çətinlik törənmirdi. Bu cəhətdən də, bu dövr İmam Sadiq əleyhissəlamın və şiələrin nisbi rahatlıq və azadlıq dövrü, onların elmi-mədəni fəaliyyətləri üçün çox yaxşı fürsət

.hesab olunurdu

## Xüsusi mədəni şərait

Fikir və mədəniyyət cəhətdən də, İmam Sadiq əleyhissəlamın dövrü mədəniyyət və fikir yüksəlişi dövrü olmuşdur. O dövrdə İslam cəmiyyəti içərisində misli görünməmiş dərəcədə elmə həvəs yaranmış və müxtəlif elmlər, istər Quran qiraəti, təfsir, hədis, fiqh və əqaid kimi İslami elmlər, istərsə də tibb, fəlsəfə, astronomiya, riyaziyyat və bu kimi digər dünyəvi elmlər meydana gəlmişdi. Belə ki, azca düşüncə tərzi olan hər bir şəxs elm bazarına müraciət edirdi. Deməli, İmamın cavab verməsinin labüd olduğu bir .elm teşnəliyi yaranmışdı

:Bu elmi yüksəlişə səbəb olan amilləri aşağıdakı şəkildə xülasə etmək olar



---

.Müxtəsəri-tarixil ərəb, səh.۱۹۳ [۸] -۱

.Vəfəyatül-ə'yan, c.۱, səh.۳۲۷ [۹] -۲

۱. İslamda fikir və əqidə azadlığı; Düzdür, bu fikir azadlığında Abbasilərin də rolu olmuşdur, ancaq bu azadlığın bünövrəsi İslam təlimlərində idi. Yəni, əgər Abbasilər bunun qarşısını almaq istəsəydilər, yenə bacarmazdılar.

۲. O dövrün mühiti tamamilə bir İslami mühit olmuş və camaat məzhəbi fikirlərin təsir dairəsində olmuşdur. İslam Peyğəmbərinin, eləcə də, Quranın elm öyrənmək, elm barədə düşünmək haqqındakı alqışları bu elmi yüksəlişin meydana gəlməsində əsas amillərdən biri olmuşdur.

۳. İslamı yenicə qəbul etmiş qəbilələrin əksəriyyəti elm və fikir sabiqəsinə malik olan qəbilələr olmuşlar. Hətta bəzi vaxtlar bu qəbilələr İran, Misir və Suriya qəbilələri kimi o dövr mədəniyyətinin mərkəzinin əhalisindən hesab olunurdular. Onlar İslam təlimatına dərindən yiyələnmək üçün təhqiq, tədqiqat və nəzər mübadiləsi ilə məşğul olurdular.

۴. Dini güzəşt, yaxud qeyri-müsəlmanlarla, xüsusən də, kitab əhli ilə dinc-yanaşı qonşuluq. Müsəlmanlar kitab əhli ilə yola gedir və bunu heç də öz dini qayda-qanunlarına zidd bilmirdilər. O dövrdə kitab əhli əsasən, alim və savadlı adamlar olmuşlar. Müsəlmanlar onlarla elmi əlaqələr yaradır, bu isə təbii ki, bəhs, təhqiqat və elmi münazirələrə gətirib çıxarırdı.(۱)

**Məzhəb və firqələrin bir-biri ilə rəftarı**

İmam Sadiq əleyhissəlamın dövrü, həm düşüncə və fikirlərin bir-biri ilə mübadilə olunması, həm də məzhəb və firqələrin meydana gəldiyi bir dövr olmuşdur. Müsəlmanların kitab əhlinin, eləcə də yunan alimlərinin əqidə və nəzərləri ilə üzləşməsi nəticəsində müxtəlif növ çətinliklər irəli çıxmışdı. O dövrdə Mötəzilə, Cəbriyyə, Mürciə, Qulat,(۲) Zənadiqə,(۳) Müşəbbihə, Mütəsəvvifə, Mücəssəmə, Tənasüxiyyə və bu kimi məzhəblər yaranmış və bunların hər biri öz əqidələrini yaymağa çalışmışlar. Bundan da əlavə, İslami elmlərin hər birində o elmin alimləri arasında fikir müxtəlifliyi yaranırdı. Məsələn, Quran qiraəti, təfsir, hədis, fiqh və əqaid elmlərində qızğın mübahisələr yaranır, hərə bir cür hökm verərək müxtəlif nəzəriyyəni himayə edirdi.

**Böyük Cəfəri məktəbi**

İmam Sadiq (əleyhissəlam) yaranmış əlverişli siyasi vəziyyəti və cəmiyyətin böyük ehtiyacını, həmçinin, ictimai şəraitin hazır olduğunu nəzərə alıb atası İmam Baqir əleyhissəlamın elmi və mədəni inqilabının yolunu davam etdirərək böyük elm ocağı, böyük məktəb təsis etdi. O dövrün dini və dəqiq elmləri sahəsində sayı dörd minə yaxın qeyd edilmiş Hişam ibn Həkəm, Məhəmməd ibn Müslim, Əban ibn Təğlib, Hişam ibn Salim, Mömin Taq, Müfəzzəl ibn Ömər, Cabir ibn Həyyan və s. kimi seçilmiş böyük şagirdlər yetişdirdi.(۴) Bu şagirdlərin hər biri öz növbəsində böyük elmi şəxsiyyət və parlaq simalardan olub böyük xidmətlər göstərmişdir. Onlardan bəziləri böyük elmi əsərlər yazmış, çoxlu şagirdlər yetişdirmişlər. Misal üçün qeyd edə bilərik ki, Hişam ibn Həkəm otuz bir cild,(۵) Cabir ibn Həyyan isə müxtəlif elmlər sahəsində, istər dəqiq elmlər, istər təbiət elmləri, istərsə də o dövrdə geniş yayılmış kimya sahəsində iki yüz cilddən



---

۱- [۱۰] Məsum İmamların həyatına bir baxış, səh.۱۴۲-۱۶۰.

۲- [۱۱] Əl-İmamüs-Sadiq vəl-məzahibül-ərbəə.

۳- [۱۲] Zənadiqə firqəsi Allahı və bütün dinləri inkar edən bir məzhəb olmuşdur.

۴- [۱۳] Əl-İrşad, səh.۲۷۱.

۵- [۱۴] Elamül-Vəra, səh.۲۸۴.

artıq(1) kitab yazmış, məhz buna görə də, “kimyanın atası” ləqəbini almışdır. Cabirin kitabları orta əsrlər dövründə Avropanın müxtəlif dillərinə tərcümə edilmişdir. Yazıçılar .onun xatirəsini böyük əzəmətlə yad edirlər

**Tövhidi Müfəzzəl risaləsi**

Qeyd etdik ki, İmam Sadiq (əleyhissəlam) təbii elmlər sahəsində bir sıra elmi bəhslər aparmış, bu günkü alimləri heyrətə gətirən üstüörtülü sirləri açmışdır. Bu məsələnin ən aşkar nümunəsi (Cabiri yetişdirməsindən əlavə) Tövhidi Müfəzzəldir. İmam Sadiq (əleyhissəlam) onu dörd gün ərzində imla etmiş, Müfəzzəl ibn Ömər Kufi də onu qələmə alaraq nəticədə “Tövhidi Müfəzzəl” adlı kitabı meydana gəlmişdir. Müfəzzəl özü bu kitabın müqəddiməsində deyir: “Bir gün axşamçağı Peyğəmbərin məscidində oturub o Həzrətin əzəməti və Allahın ona əta etdiyi şərəf, fəzilət və s. barədə fikirləşirdim. Bu vaxt Zənadiqə firqəsindən olan ibn Əbül-Əvca məscidə daxil olub bir yerdə oturdu. Mən onun söhbətini eşidirdim. Dostlarından biri də gəlib onun yanında oturduqdan sonra bu iki nəfər İslam Peyğəmbəri barədə nə isə danışmağa başladılar. İbn Əbül-Əvca dedi: “Ağlım adında heyran qalmış, işlərində çaş-baş qalmış Məhəmmədin (səlləllahu əleyhi və alih) adından əl çək, onun gətirdikləri barədə söhbət et.” Sonra onlar Allah-taala barədə söhbət etməyə başladılar. Söhbətlərinin nəticəsi belə oldu ki, bu dünyanın heç yaradanı yoxdur, hər şey öz-özünə təbiətdə yaranmışdır. ”.Bu həmişə belə olub və belə də olacaq

Müfəzzəl sonra əlavə edib deyir: Bu axmaq və əsassız sözləri Allah rəhmətindən uzaq düşmüş bu şəxsdən eşitdikdə hirsimdən dayana bilməyib dedim: “Ey Allahın düşməni! Kafir olmusan? Səni ən gözəl surətdə yaratmış, müxtəlif hallardan çıxarıb nəhayət bu həddə yetirən Allahı inkar edirsən? Əgər özünə nəzər salıb bir az fikirləşsən, Allahın nişanələrini elə öz vücudunda müşahidə edərsən. Görərsən ki, Onun elm və hikmət ”.nişanələri sənin öz vücudunda cəmlənmişdir

İbn Əbül-Əvca dedi: “Ay kişi, əgər sən mütəkəllimlərdənsənsə (əqaid elmindən xəbərdar olub bəhs və münazirədə mahirsənsə), səninlə onların dilində danışım, əgər bizi məğlub etsən, sənə tabe olacağıq. Yox, əgər onlardan deyilsənsə, səninlə söhbət etməyin faydası yoxdur. Əgər Cəfər ibn Məhəmməd Sadiq əleyhissəlamın

dostlarındansansa, heç onun özü bizimlə bu cür söhbət etmir. O, bizim bu sözlərimizi səndən də çox eşidib, ancaq bizi acılamayıb və bizimlə söhbətdə ədəb-ərkanı qoruyub saxlayıb. O, səbirli, təmkinli və ağıllı adamdır, heç vaxt qəzəb onu üstələyə bilmir. Bizim sözlərimizi dinləyir, ürəyimizdə nə varsa deyirik, elə bilirik ki, ona qalib gəlmişik, o isə çox az söhbətlə hüccəti bizə tamamlayır. Belə ki, daha ona cavab verə bilmirik. Əgər sən də onun tərəfdarlarındansansa, onda ona layiq şəkildə bizimlə söhbət et".

Mən qəmli halda məsciddən çıxdım. İslam və müsəlmanların bu cür kafirlərə və onların Allahı inkar etmələri barədəki şəkk-şübhələrinə mübtəla olması barədə fikirləşirdim. Ağam İmam Sadiq əleyhissəlamın hüzuruna gəldim. İmam məni qəmgin və fikirli görüb soruşdu: "Sənə nə olub?" Mən o kafirlərin sözlərini İmam əleyhissəlama dedim. İmam (əleyhissəlam) buyurdu: "Sənin üçün Allahın, dünyanın – heyvanların, yırtıcıların, həşəratların, quşların, ümumiyyətlə, hər hansı bir canlının, istər insan olsun, istər heyvan, istərsə də bitki - meyvəli ağaclar, meyvəsiz ağaclar, yeyilməli bitkilər, yeyilməyən bitkilərin - yaradılmasında olan hikmətini açıqlayacağam. Qoy ibrət



---

۱- [۱۵] Əl-fihrist, səh.۵۱۲-۵۱۷.

götürənlər ondan ibrət götürsün və möminlər onunla öz mərifətlərini artırsın, kafir və ”...inadkarlar isə ona heyran qalsınlar. Sabah səhər bizə gəl

Bu söhbətdən sonra Müfəzzəl dörd gün ardıcıl olaraq İmam Sadiq əleyhissəlamın hüzuruna getdi. İmam Sadiq (əleyhissəlam) insanın yaranışı, yaranışın əvvəli, zahiri və batini qüvvələr, insanın fitri sifətləri, insanın bədən üzvləri, müxtəlif növ heyvanların yaranışı və eləcə də, yer-göyün yaranması, bəla və təbii fəlakətlərin fəlsəfəsi və bir (çox başqa məsələlər barədə söhbət etdi və Müfəzzəl də onları qeydə aldı.(١

### İmam Sadiq (əleyhissəlam) məktəbinin genişliyi

İmam Sadiq (əleyhissəlam) o dövrün bütün ideoloji və əqidəvi qurumları ilə üzləşmiş, İslam və şiəçiliyin mövqeyini onlar üçün aşkar edərək İslam dünya görüşünün .onlardan üstün olduğunu sübuta yetirmişdir

İmam Sadiq əleyhissəlamın əzəmətli elmindən təkcə şiələr deyil, eləcə də sünni məzhəbinin nümayəndələri də faydalanırdılar. Sünni məzhəbinin tanınmış rəhbərləri bilavasitə, ya da hər hansı bir vasitə ilə o Həzrətin şagirdləri olmuşlar. Bu rəhbərlərin önündə Əbu Hənifə durur. O, iki il İmam Sadiq əleyhissəlamın şagirdi olmuşdur. Əbu Hənifə bu iki ili öz elminin bünövrəsi kimi qeyd edərək deyir: “Əgər o iki il olmasaydı, (Noman (Əbu Hənifə) həlak olardı.”(٢

İmam Sadiq əleyhissəlamın şagirdləri Kufə, Bəsrə, Vasit, Hicaz və digər müxtəlif şəhərlərdən, həmçinin, Bəni–Əsəd, Məxariq, Teyy, Süleym, Qətəfan, Əzd, Xüzaə, Xəsəm, Bəni-Zəbbə, Qüreyş, xüsusilə də, Bəni-Haris ibn Əbdülmüttəlib və Bəni-Həsən (qəbilələrindən olmuşlar.(٣

İmam Sadiq (əleyhissəlam) məktəbinin genişliyi haqqında bu yetər ki, İmam Riza əleyhissəlamın şagirdlərindən olan (və neçə il İmam Sadiq əleyhissəlamdan sonra yaşayan), böyük hədisçilərdən biri olmuş Həsən ibn Əli ibn Ziyad Vəşşa deyir: “Kufə məscidində hamısı Cəfər ibn Məhəmməd əleyhissəlamdan hədis söyləyən doqquz yüz (hədis müəllimi gördüm.”(٤

İbn Həcər Əsqəlaninin dediyinə görə Şübə, Süfyani Suri, Süfyan ibn Üyeynə, Malik, İbn Cərih, Əbu Hənifə, Musa ibn Əbu Hənifə, Vəhib ibn Xalid, Qəttan, Əbu Asim və bu kimi

bir çox digər fəqih və hədisçilər İmam Sadiq əleyhissəlamdan hədis söyləmişlər.(۵) Şafei yazır: "Onun (İmam Sadiq əleyhissəlamın) tövhid və digər sahələrdə qiymətli kəlamları var. Onun şagirdi olmuş Cabir ibn Həyyan beş yüz risalədən ibarət olan min vərəqli bir kitab yazmışdır."(۶)

İmam Sadiq (əleyhissəlam) öz şagirdlərinin hər birini onun istedadına uyğun olan sahədə yetişdirir, nəticədə şagirdlərinin hər biri hədis, təfsir, əqaid və bu kimi elmlərin biri və ya ikisində mütəxəssisə çevrilirdi. Bəzi vaxtlar İmam Sadiq (əleyhissəlam) onunla elmi bəhs və münazirə etmək istəyən şəxslərə bildirirdi ki, onun həmin sahədə mütəxəssis olmuş tələbəsi ilə bəhs etsin. Hişam ibn Salim deyir: "Bir gün İmam Sadiq əleyhissəlamın bir neçə dostu ilə birlikdə o Həzrətin yanında oturmuşduq. Bu vaxt Şam

səh:۶

---

۱- [۱۶] Tövhidi–Müfəzzəl, səh.۷-۱۱.

۲- [۱۷] Əl-İmamüs-Sadiq vəl-məzahibül-ərbəə, c.۱, səh.۷۰.

۳- [۱۸] Əl-imamüs-Sadiq vəl-məzahibül ərbəə, c.۱, səh.۳۸.

۴- [۱۹] Ricalü-Kəşşi, səh.۳۹-۴۰.

۵- [۲۰] Təhzibüt-təhzib, c.۱, səh.۸۸.

۶- [۲۱] Mir'atül-cinan, c.۲, səh.۳۰۴.

şəhərindən olan bir kişi icazə istəyib məclisə daxil oldu. İmam ona əyləşmək üçün yer göstərdi. Sonra ondan soruşdu: “Nə istəyirsən?” Şam şəhərindən olan kişi dedi: “Eşitmişəm ki, siz camaatın bütün suallarına cavab verib çətinliklərini həll edirsiniz, mən də gəlmişəm sizinlə elmi bəhs edəm.” İmam Sadiq (əleyhissəlam) buyurdu: “Hansı mövzuda bəhs etmək istəyirsən?” Şam şəhərindən olan kişi dedi: “Quranın qiraəti barədə.” İmam Sadiq (əleyhissəlam) üzünü Həmrana tutub buyurdu: “Həmran, bu kişinin cavabı sənin öhdənədir.” Şamdan olan kişi dedi: “Mən Həmranla yox, məhz Sizinlə bəhs etmək istəyirəm.” İmam Sadiq (əleyhissəlam) buyurdu: “Əgər Həmranı məğlub etsən, elə bil ki, məni məğlub etmisən.” Şam şəhərindən olan kişi çarəsiz qalıb Həmranla bəhsə başladı. Nə dedisə, Həmrandan qəti və qaneedici cavab eşitdi. Belə .ki, nəhayət yorulduğu üçün bəhsi davat etdirməkdən əl çəkdi

”?İmam Sadiq (əleyhissəlam) buyurdu: “Həmranın səviyyəsi necədir

Şamlı kişi: “Doğrusu, Həmran çox mahirdir, nə soruşdumsa, layiqincə cavab verdi. İndi ”.istəyirəm sizinlə lüğət və ərəb ədəbiyyatı barədə bəhs edəm

”!İmam Sadiq (əleyhissəlam) üzünü Əban ibn Təğlibə tutub buyurdu: “Onunla bəhs et

.Əban ibn Təğlib onun bütün suallarına cavab verib onu susdurdu

Şam şəhərindən olan kişi dedi: “İstəyirəm fiqh (şəriət elmi) sahəsində sizinlə bəhs ”.edəm

”!İmam Sadiq (əleyhissəlam) Zürarəyə buyurdu: “Onunla bəhs et

.Zürarə onunla bəhs edib qısa bir zamanda onu məğlub etdi

”.Şamdan olan kişi dedi: “İstəyirəm əqaid barəsində sizinlə bəhs edəm

İmam Sadiq (əleyhissəlam) Mömin ibn Tağa buyurdu ki, onunla bəhs etsin. Çox .çəkmədi ki, Mömin ibn Taq da onu məğlub etdi

Daha sonra Şam şəhərindən olan kişi insanın xeyir və ya şər işi tərk edə bilməsi, yaxud bilməməsi, tövhid və İmamət barədə bəhs etmək istədikdə İmam Sadiq (əleyhissəlam) ardıcıl olaraq Həmzeyi-Təyyar, Hişam ibn Salim və Hişam ibn Həkəmə

buyurdu ki, onunla bəhs etsinlər. Bu üç nəfərin üçü də Şam şəhərindən olan kişini qəti .və əsaslı sübutlarla məğlub etdilər

Bu həyəcanlı hadisəni müşahidə etməklə sevincdən İmam Sadiq əleyhissəlamın (dodaqlarına şirin bir təbəssüm qonmuşdu.(١

**İmam Sadiq əleyhissəlamın münazirələri**

Bundan öncə qeyd etdik ki, İmam Sadiq əleyhissəlamın yaşadığı dövr fikir və düşüncə mübarizəsi, müxtəlif məzhəb və firqələrin meydana gəldiyi dövr olmuşdur. İslam maarif və mədəniyyətinin yunan alim və filosofların fikir və rəyləri ilə mübarizəsi nəticəsində bir sıra şübhələr meydana çıxmışdı. Buna görə də, İmam Sadiq (əleyhissəlam) İslam və şiə əsaslarını tanıtdırmaq məqsədi ilə bu məzhəblərin başçı və tərəfdarları ilə çoxsaylı və həyəcanlı münazirələr edirdi. Bu münazirələrlə o, bu məzhəblərin əqidəsinin puç, İslam əqidəsinin isə üstün olduğunu kəskin və məntiqli .sübutlarla isbat edirdi

İmam Sadiq əleyhissəlamın müxtəlif münazirələri arasından nümunə üçün o Həzrətin Hənəfi məzhəbinin banisi Əbu Hənifə ilə münazirəsini hörmətli oxucuların nəzərinə .çatdırırıq



---

.İxtiyari-mə’rifətir-rical, səh.٢٧٥-٢٧٨ ١ -١

Bir gün Əbu Hənifə İmam Sadiq (əleyhissəlam) ilə görüşmək məqsədilə onun evinə .gəlib görüş üçün icazə istədi. İmam Sadiq (əleyhissəlam) icazə vermədi

Əbu Hənifə deyir: Bir qədər qapının ağzında gözlədim. Bu vaxt bir neçə kufəli şəxs gəlib İmam əleyhissəlamla görüşmək üçün icazə istədi. İmam onlara icazə verdi. Mən də onlarla birlikdə içəri girdim. Onun hüzuruna yetişdikdə dedim: “Yaxşı olar ki, siz Kufəyə bir nümayəndə göndərib oranın əhalisini Peyğəmbərin səhabələrinə nalayiq sözlər deməkdən çəkindirəsiniz. Orada on min nəfərdən çox adam Peyğəmbərin dostları üçün nalayiq sözlər deyir.” İmam Sadiq (əleyhissəlam) buyurdu: “Camaat mən ”.deyəni qəbul etmir

Əbu Hənifə: “Siz Allah Peyğəmbərinin nəvəsi olduğunuz bir halda, necə ola bilər ”!?camaat sizin sözünüzü qəbul etməsin

İmam Sadiq (əleyhissəlam): “Mənim sözümə qulaq asmayanlardan biri də, elə sən özünsən. Məgər mənim icazəm olmadan evə daxil olmamısan, mənim icazəm ”?olmadan oturmamısan və mən icazə verməmiş sözə başlamamısan

”!Sonra əlavə edib buyurdu: “Eşitdiyimə görə sən müqayisə əsasında hökm verirsən

!Bəli —

Vay olsun sənə! Müqayisə əsasında hökm verən ilk şəxs (məxluq) Şeytan olmuşdur. — Allah ona “Adəmə səcdə et” – deyə buyurduqda o cavab verdi ki: “Mən səcdə etmirəm, ”.çünki mən ondan daha yaxşıyam. Sən məni oddan, onu isə palçıqdan yaratdın

Sonra İmam Sadiq (əleyhissəlam) şəriətdə müqayisənin batil olduğunu isbat etmək) (:üçün bununla zidd olan bir neçə şəriət hökmü qeyd edərək buyurdu

?Səncə bir nəfəri nahaqdan öldürməyin günahı ağırdır, yoxsa zinanın —

.Bir nəfəri nahaqdan öldürməyin —

Əgər müqayisə olunan hökmə əməl etmək olarsa) bəs nə üçün qətl hadisəsini isbat) — etmək üçün iki, zinanı isbat etmək üçün isə dörd şahid lazımdır? İslamın bu qanunu ?müqayisə ilə uyğun gəlirmi

— Xeyr!

— Sidik daha çox murdardır, yoxsa məni?

— Sidik.

— Bəs nəyə görə birincidə (sidikdə) Allah-taala insanlara dəstəmaz almağı, ikincidə (mənidə) isə qüsl almağı əmr edir? Bu hökm müqayisə ilə uyğundur?

— Xeyr!

— Namaz daha çox əhəmiyyətlidir, yoxsa oruc?

— Namaz.

— Xeyr!

— Qadın daha çox zəifdir, yoxsa kişi?

— Qadın.

— Bəs nə üçün kişinin irs payı qadının irs payının iki bərabəri qədərdir? (Əgər qadın zəifdirsə, onda qoy o daha çox irs aparsın.) Bu hökm müqayisə ilə uyğun gəlirmi?

— Xeyr!

— Nə üçün on dirhəm oğurlamış şəxs barədə Allah onun əlinin kəsilməsini, ancaq bir nəfər digər birisinin əlini kəsərsə, beş yüz dirhəm diyə verməsini əmr etmişdir? Bu hökm müqayisə ilə uyğun gəlirmi?

— Xeyr!

Eşitmişəm ki, sən "Sonra da həmin gün [Qiyamət günü] [Allahın dünyada sizə əta — etdiyi] nemətlər barəsində mütləq sorğu-sual olunacaqsınız" (١) ayəsini belə təfsir edirsən: "Allah insanları yay fəslində yedikləri dadlı yeməklər və içdikləri sərin sular ".barədə sorğu-suala çəkəcək

.Düzdür, mən bu ayəni bu cür təfsir etmişəm —

Əgər bir nəfər səni evinə qonaq aparıb qarşına dadlı yemək və sərin su qoysa, — ?sonra bu işinə görə sənə minnət qoyarsa, bu adam barəsində necə fikirləşərsən

.Deyərəm ki, xəsis adamdır —

(?Allah xəsisdirmi? (Yəni, bizə bəxş etdiyi yeməklər barədə bizi sorğu-suala çəkər —

Əbu Hənifə: "Bəs, Quranın "insanlar onlar barədə sorğu-sual olunacaqlar" dediyi "?nemətlərdən məqsəd nədir

İmam Sadiq (əleyhissəlam): "Ondan məqsəd biz Əhli-beyt əleyhissəlamın (dostluğudur."(٢

### Əhkamın şiəliyə xas olan şəkildə bəyan olunması

İmam Sadiq (əleyhissəlam) vasitəsilə böyük elm və fiqh ocağının təsis edilməsi mövzusunda o Həzrətin həyatını araşdıranların əksəriyyəti üçün məlum olmayan cəhət bu işin siyasi və əks mövqe daşımasıdır. Bu hərəkətin siyasi cəhətlərinin aşkar .olunması üçün ilk növbədə aşağıdakı məsələyə diqqət yetirməliyik

İslamda xilafət sistemi digər ölkələrin hakimiyyət sistemi ilə ona görə fərqlənir ki, bu, təkcə siyasi təşkilat yox, eyni zamanda siyasi-məzhəbi bir təşkilatdır. İslami rəhbərə xəlifə adının ünvanlanması onu göstərir ki, o, siyasi rəhbərdən əlavə ilk növbədə Peyğəmbər canişinidir, Peyğəmbər isə din gətirmiş və əxlaq öyrədən bir şəxs olmuşdur. Deməli, İslamda xəlifə olmaq bu deməkdir ki, o, siyasi aləmdə vəzifə daşıması ilə yanaşı camaatın dini məzhəbi işlərini də öhdəsinə götürmüşdür. Tam qəbul edilmiş bu məsələ ona gətirib çıxartdı ki, ilk İslami xəlifələrdən sonra hakimiyyətə gələn dini məlumatı az olan, bəzən də dini məlumatı sıfır səviyyəsində

olan xəlifələr bu qərara gəldilər ki, bu çatışmazlığı onlara tabe olan din alimlərinin köməyi ilə aradan qaldırsınlar və yaltaq hədisçi, təfsirçi və fəqihləri öz saraylarına cəlb etməklə hakimiyyət sistemini yenə də din və siyasət əsasında qursunlar. Bu cür şəxsləri saraya cəlb etməkdə xəlifələr üçün başqa bir məqsəd də ondan ibarət idi ki, onlar zalım və ədalətsiz xəlifələrin istəyinə əsasən, şəriət hökmələrini günün məsləhəti bəhanəsi ilə asanlıqla dəyişib, xəlifələrin tamahı əsasında (avam camaat .üçün fərq qoyulması məlum olmayan) hökmləri istənilən şəkildə ələ gətirsinlər

Ötən əsrlərin yazıçı və tarixçiləri insanı dəhşətə gətirən bir sıra qondarma olan yalan hədis və şəxsi fikir əsasında verilmiş təfsir nümunələrini qeyd etmişlər ki, onlarda siyasi qüvvələrin təsiri açıq-aşkar hiss edilir. Eynilə bu iş Quranın təfsiri barədə də icra olunurdu. Quranın, təfsirçinin öz şəxsi fikrinə əsasən təfsir olunması, Allahın hökmünü camaatın gözündə dəyişib onu öz istədiyi kimi (təbii ki, təfsirçinin istədiyi xəlifənin istəyi ilə uyğun gəlirdi) qələmə verə bilməsi bu cür işlərdən biri idi. Bu səbəbə görə, elə İslamın lap ilkin çağlarından fiqh (şəriət elmi), hədis və təfsir iki hissəyə bölünür. Birinci dəstə qəsbkar hökumət orqanlarına tabe olan dəstə olmuş və əksər hallarda həqiqəti hökumətin



---

.Təkasur" surəsi, ayə ۸" [۲۲] -۱

.Biharül-ənvar, c.۱۰, səh.۲۲ [۲۳] -۲

məsləhətinə qurban verərək dünya malına çatmaq üçün Allahın hökmünü təhrif etmişdir. İkinci dəstə isə doğru və düzgün İlahi hökmlərə heç bir məsləhəti üstün tutmayan əsl İslami dəstə olmuşdur. Təbii ki, onlar hər an hakimiyyət və onun yaltaq fəqihləri ilə baş-başa gəlmiş və bu səbəbdən də çox vaxtlar qeyri-rəsmi şəkildə .fəaliyyətdə olmuşlar

### İmam Sadiq (əleyhissəlam) məktəbinin hökumətə qarşı olan etirazının məfhumu

Yuxarıda qeyd etdiklərimizi nəzərə alsaq, asanlıqla başa düşərik ki, Cəfəri fiqhi İmam Sadiq əleyhissəlamın dövründəki rəsmi fəqihlərə qarşı təkcə sadə bir dini ixtilaf olmamış, eyni zamanda hökumətə qarşı iki məzmunu da özündə ehtiva etmişdir. Onların birincisi və eləcə də, ən əsası hökumət orqanlarının lazımi dini məlumatlardan xəbərsiz olmasını və camaatı ideoloji cəhətdən idarə edə bilmədiklərini isbat etmək olmuşdur. Yəni, həqiqətdə onların xilafət kürsüsündə oturmağa layiq olmadıqları sübut olunurdu. İkincisi isə hökumətə bağlı olan fəqihlərin fiqhi məsələləri bəyan etmək və onların, hakim dairələrin istəklərini nəzərə alaraq qeyri-İslami məsləhətləri əsasında qurduqları şəriətdə dinin təhrif olunmasını sübuta yetirmək idi. İmam Sadiq (əleyhissəlam) elm ocağını genişləndirib fiqh, İslam maarifi, Quran təfsirini hökumətə bağlı olan alimlərin dediyindən fərqli bəyan etməsi əməli olaraq hökumətə qarşı atılmış bir addım idi. O Həzrət hamısı bir növ hökumətin əsas hissəsi sayılan rəsmi fiqh və məzhəbi təşkilatların səhvlərini üzə çıxarıb hökumət orqanının şəriətdən kənar .olduğunu isbat edirdi

İmam Sadiq əleyhissəlamın səhabələrinə buyurduğu təlim və müzakirələrində xəlifələrin dini elmlərdən xəbərsiz olduqları məsələsi, İslam nöqteyi-nəzərindən onların xəlifəliyə səlahiyyətləri olmadığı açıq-aşkar müşahidə olunur. Yəni, İmam Sadiq (əleyhissəlam) öz fiqh və Quran dərslərinin ehtiva etdiyi hökumətlə qarşıdurma məsələsini səhabələri arasında açıq-aşkar müzakirəyə qoyurdu. İmam Sadiq əleyhissəlamdan olan hədisdə oxuyuruq: “Biz o kəslərik ki, Allah-taala bizə itaət etməyi camaata vacib buyurmuşdur. Halbuki, camaat elə bir şəxsə itaət edir ki, sabah onun cahilliyi ucbatından Allah dərgahında üzürlü sayılmayacaqlar.” (١) Bu o deməkdir ki, camaat rəhbər və xəlifələrinin cahilliyi nəticəsində səhvə düçar olub Allah yolundan başqa yola getdiklərinə görə üzürlü sayılıb deyə bilməzlər ki, biz öz seçimimizə görə

səhv etməmişik. Bizi bu yola sürükləyən bizim cahil rəhbərlərimiz olmuşdur. Bu üzr əsla qəbul olunmayacaq, çünki, bu cür rəhbərlərdən itaət etməyin özü səhv bir iş olub (sonrakı səhvlərə bəhanə ola bilməz.(۲

## İmam Sadiq (əleyhissəlam) məktəbinin şagirdlərindən bir nümunə

Qeyd etdik ki, İmam Sadiq əleyhissəlamın məktəbində yetişmiş tələbələrin sayı dörd minə çatırdı. Burada onların bir neçəsi barədə məlumat vermək yaxşı olardı, ancaq qısa olsun deyə təkcə onlardan biri haqqında məlumat verəcəyik. O da Hişam ibn .Həkəmdir

səh:۱۰

---

.Üsuli Kafi", c. ۱, səh. ۱۸۶" [۲۴] -۱

.Doğru rəhbər, səh.۸۷-۹۱ [۲۵] -۲

## Hişam ibn Həkəmin elmi əzəməti

Hişam görkəmli alim, böyük əqaidçi, şirin və gözəl nitq sahibi və elmi mübahisədə çox mahir bir şəxsiyyət idi. O, İmam Sadiq (əleyhissəlam) və İmam Kazim əleyhissəlamın .məktəbinin ən görkəmli şagirdlərindən biri hesab olunurdu

Hişam ibn Həkəm şiələrin hər tərəfdən müxtəlif məzhəblər və siyasi qüdrətlərin təzyiqlərinə məruz qaldığı bir dövrdə şiə dünyasına çox böyük xidmətlər göstərmiş, xüsusən şiə məzhəbinin əsas əqidə dayaqlarından biri olan İmamət mövzusunu layiqincə müdafiə etmiş, onun cəmiyyəti islah edə biləcək mənasını gözəl şəkildə bəyan etmişdir. Düzdür, Hişamın əqidə dayaqları və elmi şəxsiyyəti İmam Sadiq əleyhissəlamın məktəbində möhkəmlənmiş və bu məktəbdə onun İslami və fikri təkamülü öz inkişafını davam etdirmişdir. Ancaq hicrətin yüz qırx səkkizinci ilindən sonra, yəni, İmam Sadiq (əleyhissəlam) şəhid olduqdan sonra Hişamın böyük şəxsiyyətliyi İmam Kazım əleyhissəlamın tövsiyələri ilə təkamülə çatmış və bu sahədə .son həddə qədər irəliləmişdir

## Hişam həqiqət axtarışında

Hişamın həyat tarixinə nəzər yetirdikdə, məlum olur ki, o, elm və həqiqət vurğunu olmuş, bu məqsədinə çatmaq və elm mənbəyindən sirab olmaq üçün əvvəl öz dövrünün elmlərini öyrənmiş, sonra isə elmini təkmilləşdirmək üçün yunan filosoflarının kitablarını oxuyub fəlsəfəni çox yaxşı mənimsəmişdi. Hətta o, axırda Aristotelin fəlsəfəsinin inkarına dair bir kitab yazmışdı. Daha sonra öz elmi-fikri təkamülünün tələbinə əsasən, müxtəlif məktəblərdə olmuş, ancaq heç hansı bir məktəbin fəlsəfəsi onu qane etməmişdi. Onun elm teşnəliyini yalnız İslamın möhkəm, məntiqəuyğun və aşkar təlimatı söndürə bilmişdir. Buna görə də, müxtəlif məktəblərlə tanış olduqdan sonra onlardan uzaqlaşmış və əmisi vasitəsilə İmam Sadiq əleyhissəlamla tanış olmuşdur. Həmin tarixdən etibarən onun həyat tərzi İslamla olan .dərin tanışlığı və şiə məntiqini qəbul etməsi sayəsində tamamilə dəyişilmişdir

Bəziləri demişlər: “Hişam ibn Həkəm əvvəllər bir müddət (Zənadiqə məzhəbindən olub tam materializm əqidəsində olan) Əbu Şakir Disaninin şagirdi olmuş, sonra isə cəbriyyə məzhəbinə keçərək bu əqidəyə mənsub Cəhm ibn Səfanın tərəfdarlarından

”.biri olmuşdur

Bu fikirdə olan şəxslər bu məsələni Hişamın zəif cəhətlərindən sayıb onu əqidə pozğunluğu ilə ittiham etmişlər. Halbuki, əvvəla o, nəinki Əbu Şakir Disaninin şagirdi olmamışdır, hələ onunla bir sıra elmi mübahisələr aparıb, onun İslam dininə gəlməsinə səbəb olmuşdur.(١) Üstəlik təsəvvür etsək ki, bu fərziyyə düzgündür və Hişam yuxarıda qeyd etdiyimiz məzhəblərin əqidələri ilə maraqlanıb, bu o demək deyildir ki, o, həmin məzhəblərin əqidəsini qəbul etmişdir. Onların əqidəsi ilə maraqlanmaq sadəcə olaraq onunla bəhs və elmi müzakirə etmək üçün olmuşdur. İkincisi də, bu dəyişikliklər onun əqli və fikri təkamülünün seyr etmək funksiyasını daşımış, həqiqət axtarışında olub haqqı son dərəcə agahlıq nəticəsində tapmaq istəyən şəxs üçün heç də zəif cəhət hesab olunmur. Əksinə, bu, onun əqidə və fikri təkamülünün son həddi kimi başa düşülməli və buna əsasən, hökm yürüdülməlidir.(٢) Bunu da bilirik ki, Hişam ömrünün sonunadək İslamın və



---

.Qamusür-rical, c.٩, səh.٣٥١ [٢۶] -١

.Tənqihül-məqal, c.٣, səh.٣٠١ [٢٧] -٢

şiə məzhəbinin əsaslarının təbliği sahəsində çalışmış, həyat tarixində parlaq səhifələr .qoyub getmişdir

### Fikirlərin mübarizə dövrü

Öncə qeyd etdiyimiz kimi hicrətin ikinci əsri elm, araşdırma, fikir mübarizəsi və İslam cəmiyyəti arasında müxtəlif növ məzhəb və firqələrin əmələ gəlməsi dövrü olmuşdur. İslam dininin elə ilk gündən elmin inkişafı yolunda atılmış bir addım olmasına baxmayaraq, hicrətin ikinci əsrində bir tərəfdən müsəlman alimlərinin yunan və biganə fəlsəfələrdən xəbərdar olmaları, digər tərəfdən də İslam cəmiyyəti arasında müxtəlif növ məzhəblərin əmələ gəlməsi nəticəsində elmi və məzhəbi söz-söhbətlər, müxtəlif sahələrdə aparılan elmi mübahisələr kulminasiya nöqtəsinə çatır və bu sahədə hər biri özünə görə böyük bir şəxsiyyət sayılan alimlər ortaya çıxır. Həmçinin, o dövrə qədər aparılan elmi müzakirələr sabit və tənzimlənmiş şəkildə olmadığından elmi bəhs və müzakirəyə çox ehtiyac duyulurdu.(١) Bu səbəblərə görə müxtəlif firqələr arasında gedən elmi çəkişmələr xüsusi əhəmiyyət kəsb etmiş və müxtəlif yerlərdə diqqəti cəlb edən çoxsaylı dəyərli elmi müzakirələr aparılırdı. Həmin müzakirələrin .çoxu indi də qaynaqlarda qorunub saxlanır

Bu amillərin məcmusu müsəlmanlar arasında məsələlərin təhlilinin anlaşılmasına, elmin inkişafına gətirib çıxarmışdı. Belə ki, bu mövzu barədə İslam tarixinin qaynaqlarında xüsusi yer ayrılmışdır. Belə bir mühitdə böyüyüb boya-başa çatan Hişam ibn Həkəm yüksək istedad, böyük həvəsə malik olduğundan qısa bir vaxtda (alimlər arasında özünə yer tapdı və öz əsrinin məşhur alim və ziyalılarından biri oldu.(٢

### İlk tanışlıq

Hişam öz elmi axtarışlarında hələ ki, axtardığını tapmamışdı. Müxtəlif məzhəblərlə tanış olmasına, öz dövrünün ən məşhur elmi və məzhəbi şəxsiyyətləri ilə bəhslər etməsinə baxmayaraq, hələ öz istədiyinə nail ola bilməmişdi. Hişamın üzləşmədiyi təkcə bir nəfər qalmışdı. O da şiələrin altıncı İmamı Həzrət Cəfər ibn Məhəmməd .(əleyhissəlam) idi

Hişam tamamilə düzgün fikirləşmişdi. İmam Sadiq (əleyhissəlam) ilə görüş onun üzünə

yeni bir pəncərə açacaqdı. Buna görə də, o, şiələrdən və İmam Sadiq əleyhissəlamın tərəfdarlarından olan əmisindən onu İmam Sadiq əleyhissəlamla görüşdürməsini .xahiş etdi

Hişamın İmam Sadiq (əleyhissəlam) ilə ilk və onun elmi həyat yolunu tamamilə dəyişən .görüşü çox şirin və maraqlı olmuşdur

Hişamın Ömər ibn Yezid adlı əmisi deyir: "Cəbriyyə məzhəbinə xidmət edən qardaşoğlum Hişam, məzhəbi məsələlərdə elmi mübahisələr etmək üçün onu İmam Sadiq əleyhissəlamla görüşdürməyimi xahiş etdi. Mən ona cavab verdim ki, İmam Sadiq əleyhissəlamdan icazə almamış belə bir iş görə bilmərəm. Sonra İmamın hüzuruna gedib Hişamın onunla görüşməsi üçün ondan icazə aldım. Qırağa çıxıb bir neçə addım atdıqdan sonra qardaşoğlumun cəsarət və qorxmazlığını xatırladıb yenidən İmam əleyhissəlamın hüzuruna qayıtdım. Qardaşoğlumun cəsarət və qorxmaz olduğunu ona bildirdim. İmam Sadiq (əleyhissəlam) mənə buyurdu: "Mənim üçün narahatsan?" Tutduğum işdən utanıb



---

.Zühəl İslam, c.۲, səh.۵۴ [۲۸] -۱
.İmamət aləminin müdafiəçisi, səh.۱۴ [۲۹] -۲

səhvimi başa düşdüm. Sonra qardaşım oğlunu İmam əleyhissəlamın hüzuruna gətirdim. İçəri keçib oturduqdan sonra İmam (əleyhissəlam) ona bir sual verdi, o, cavab verə bilməyib bir qədər möhlət istədi, İmam (əleyhissəlam) da ona möhlət verdi. Hişam bir neçə gün həmin məsələnin cavabını tapmaq üçün o qapını, bu qapını döyürdü. Axırda da bir cavab tapa bilmədi. Nəhayət, çarəsiz qalıb yenidən İmam əleyhissəlamın hüzuruna getdi, İmam Sadiq (əleyhissəlam) da məsələnin cavabını .onun üçün açıqladı

İkinci görüşdə İmam Sadiq (əleyhissəlam) cəbriyyə məzhəbinin əsaslarını kökündən sarsıdan bir məsələni ortaya atdı. Hişam bu sualın da cavabında aciz qalıb heyrət və narahatçılıq içərisində məclisi tərk etdi. O, bir qədər heyrət içərisində gün keçirtdi. Axırda yenə məndən xahiş etdi ki, onu İmam əleyhissəlamla görüşdürüm. Mən yenə İmam əleyhissəlamdan onun görüşməsi üçün icazə istədim. İmam (əleyhissəlam) buyurdu: "Sabah Hiyrənin(١) filan yerində məni gözləsin." İmam əleyhissəlamın "...xəbərini Hişama çatdırdım. O, vaxt çatmazdan qabaq qərar qoyulmuş yerə getdi

Ömər ibn Yezid əlavə edib deyir: "Sonradan Hişamdan soruşdum ki, o görüşünüz necə oldu? Dedi: "Mən vaxtından tez qərar qoyulmuş yerə getdim. Bir də gördüm ki, İmam Sadiq (əleyhissəlam) bir qatıra minmiş halda təşrif gətirir. Mənə yaxınlaşdı, üzünə baxanda onun əzəməti məni elə cəzb etdi ki, hər şeyi unudub bir söz də olsun belə deyə bilmədim. O, bir qədər mənim sual verib söhbət edəcəyimi gözlədi. Onun vüqarla dolu olan intizarı mənim heyrətimi daha da artırdı. Vəziyyəti belə görən İmam ((əleyhissəlam) məni tək qoyub Hiyrənin küçələrindən birinə tərəf üz tutub getdi."(٢

:Bu macərada bir neçə maraqlı məsələ var

Hişam fövqəladə bir elmi mübahisə qüvvəsinə malikdir. Belə ki, macəranı danışan .١ (yəni Hişamın əmisi) ondan qorxu hiss edərək onun bu sahədə olan bacarıq və hünərini cəsarət və qorxusuzluq adlandırır. O, hətta (İmam Sadiq əleyhissəlamın böyük İmamət məqamından xəbərsiz olub) onun İmam əleyhissəlamla .üzləşəcəyindən nigarançılıq hissi keçirərək bu məsələni İmam əleyhissəlama bildirir

Hişamın elm və biliyə həddən artıq çox əlaqəsi var və o, elm teşnəsidir. Belə ki, bu .٢ yolda yorğunluq bilmədən ələ düşən fürsətdən istifadə edir və İmam əleyhissəlamın

suallarına cavab tapmadıqda yenidən İmam əleyhissəlamla görüşmək istəyir. O, sonuncu görüşdə qərar qoyulmuş yerə İmam əleyhissəlamdan qabaq gəlir. Bunların .hamısı onun elmə olan əlaqəsini göstərir

Diqqəti cəlb edən üçüncü məsələ İmam Sadiq əleyhissəlamın şəxsiyyətinin . ۳ əzəmətidir. Belə ki, Hişam onun qarşısında özünü itirərək bütün bildiklərini unudur və gözlərindən oxunan hörmətlə dolu baxışları ilə özünün o Həzrətin qarşısında kiçikliyinə .etiraf edir

Bəli, o mənəvi görüş öz işini görərək Hişamın həyat tərzini büsbütün dəyişdi. O gündən etibarən Hişam İmam Sadiq əleyhissəlamın məktəbinə qoşularaq keçmiş fikirlərini başından çıxartdı və bu məktəbdə elə parladı ki, İmam əleyhissəlamın digər dostlarını .da ötüb keçdi

### Hişamın əsərləri

Hişam İmam Sadiq əleyhissəlamın məktəbindən öyrəndiyi çoxlu elmlər sayəsində qısa bir zamanda yüksək elmi mərhələləri arxada qoyub şiə məzhəbinin əsaslarının təbliği və



---

.Hiyrə şəhər adıdır [۳۰] -۱

.İxtiyaru mə’rifətir-rical, səh.۲۵۶ [۳۱] -۲

məzhəbin müdafiəsində əlindən gələni etdi. O, bu sahədə çoxlu elmi əsərlər yazıb özündən yadigar qoydu. Hişamın təxminən otuza qədər olan əsər və kitablarının adını nəzərdən keçirsək, onun elmi əzəmət və gördüyü işlərin nə qədər böyük olduğunu görərik. İndi onun müxtəlif sahələrdə yazdığı əsər və kitabların adını oxucuların :nəzərinə çatdırırıq

;İmamət .١

;Əşyanın yaranmasının sübutları .٢

;Zənadiqə firqəsinə cavab .٣

;Sənəviyyə(١) firqəsinə cavab .۴

;Tövhid .۵

;Hişami–Cəvaliqiyə cavab .۶

;Təbiətçilər firqəsinə cavab .٧

;Qoca və cavan .٨

(Tövhiddə tədbir;(٢ .٩

;Mizan .١٠

;Meydan .١١

;Üstün şəxsin İmam olması əqidəsində olan şəxslərə cavab .١٢

;Camaatın İmamət məsələsində mübahisəsi .١٣

;Vəsiyyət, vəsiyyəti inkar edənlərə cavab .١۴

;Məcburiyyət və qəzavü-qədər .١۵

;İki münsif .١۶

;Mötəzilə məzhəbinin Təlhə və Zübeyr barədə olan əqidələrinə cavab .۱۷

;Qəzavü-qədər .۱۸

;Gəlmələr .۱۹

;(Mərifət (tanıma .۲۰

;(Qüdrət (imkan .۲۱

;Səkkiz qapı .۲۲

;Şeytani–Tariqə cavab .۲۳

?Qapını açmaq necə xəbər ola bilər .۲۴

;Tövhiddə Aristotelə cavab .۲۵

;Mötəzilə məzhəbinin əqidələrinə cavab .۲۶

(İmamət barədə məclislər;(۳ .۲۷

;Haram edilməyin səbəbləri .۲۸

(Vacibi hökmlər (İrs bölməsi).(۴ .۲۹

### İmam Sadiq əleyhissəlamın siyasi fəaliyyəti

Burada bunu qeyd etmək lazımdır ki, hamının təsəvvürünün əksinə olaraq İmam Sadiq əleyhissəlamın hərəkatı təkcə elm sahəsində (baxmayaraq ki, bu sahə çox geniş olmuşdur) olmamışdır. Eyni zamanda, o Həzrət siyasi fəaliyyət də göstərmişdir. Ancaq İmam əleyhissəlamın hərəkatının bu hissəsi bir çox yazıçı və təhqiqatçılar üçün naməlum qalmışdır. İndi isə “İmam Sadiq (əleyhissəlam) o dövrün vəziyyət və şəraitini nəzərə alıb

səh:۱۴

---

.Sənəviyyə ikiallahlılıq deməkdir [۳۲] -۱

٢- [٣٣] Bu kitabı Hişamın şagirdlərindən biri olmuş Əli ibn Mənsur onun elmi bəhslərindən istifadə edib yazmışdır.

٣- [٣۴] Əl-fihrist, səh.٣۵۵.

۴- [٣۵] Fihristi-müsənnifiş-şiə, səh.٣٠۴.

əsla siyasət işinə qarışmamış və heç bir siyasi fəaliyyət göstərmədən xəlifələrin siyasətləri ilə hərəkət etmişdir” deyənlərin bu fikrinin əsassız və səhv olduğunu başa düşmək üçün İmam Sadiq əleyhissəlamın bəzi siyasi fəaliyyətlərini oxucuların .nəzərinə çatdırırıq

### İmaməti təbliğ etmək məqsədi ilə nümayəndələrin göndərilməsi

İmam Sadiq (əleyhissəlam) İmamət məsələsinin əsl həqiqətini təbliğ etmək məqsədi ilə müxtəlif yerlərə nümayəndələr göndərirdi. O cümlədən, Kufə şəhərindən olan bir nəfər İmam Sadiq (əleyhissəlam) tərəfindən Xorasan vilayətinə gəlib oranın əhalisini o Həzrətə tabe olmağa dəvət etdi. Bəziləri onun dəvətini qəbul edib İmam əleyhissəlamın itaəti altına keçdi, lakin bəziləri onun dediklərini qəbul etməyib itaətdən boyun qaçırtdı, həmçinin, bəziləri də ehtiyat edib heç bir tərəfi seçmədilər. Sonra hər dəstədən bir nəfər nümayəndə seçilib İmam Sadiq əleyhissəlamla görüşə getdi. Səfər zamanı üçüncü dəstənin nümayəndəsi öz səfər yoldaşlarından birinin kənizi ilə bəyənilməz bir iş gördü. (Bu işdən heç kimin xəbəri olmadı.) Elə ki, onlar İmam Sadiq əleyhissəlamın hüzuruna gəldilər, həmin şəxs sözə başlayıb dedi: “Kufə şəhərindən bir nəfər gəlib bizi sizə itaət etməyə dəvət etdi. Bir dəstə onun dediklərini qəbul etdi, başqa bir dəstə isə qəbul etmədi, bir dəstə də ehtiyat edib heç bir tərəfi seçmədi.” İmam Sadiq (əleyhissəlam) buyurdu: “Sən hansı dəstədənsən?” O cavab verdi ki, mən ehtiyat edənlərdənəm. İmam Sadiq (əleyhissəlam) buyurdu: “Sən ki, ehtiyat edirsən, bəs, onda nəyə görə filan gecə ehtiyat etməyib elə xəyanətkar iş gördün?”(١)

Gördüyümüz kimi qeyd olunan bu hadisədə İmam Sadiq əleyhissəlamın nümayəndəsi kufəli, onun nümayəndəliyə getdiyi yer isə Xorasan vilayəti olmuş, halbuki, İmam Sadiq əleyhissəlamın özü Mədinədə yaşamışdır. Bu, İmam Sadiq əleyhissəlamın siyasi .fəaliyyət dairəsinin genişliyini göstərir

### Əməvilər sülaləsinin süquta uğramasının səbəbləri

Əməvilər sülaləsi İmam Sadiq əleyhissəlamın dövründə süquta uğradığı üçün indi də, .onların süquta uğrama səbəblərini qısaca olaraq oxucuların nəzərinə çatdırırıq

Əməvi xəlifələri hakimiyyətdə olarkən bir sıra bidət və mövhumatlar yaratmış, bunlar

da, üst-üstə yığılıb camaatın qəzəbinə səbəb olmuşdur. Bütün bunlar axırda müsəlmanların qiyamı və Bəni-Üməyyənin süqutu ilə nəticələndi. Camaatın qəzəbinə :səbəb olmuş amilləri aşağıdakı şəkildə xülasə etmək olar

İslam hökuməti Müaviyənin dövründən etibarən zülm əsasında qurulmuş irsi və .١ .fərdi bir hökumətə çevrildi

Ümumi işlər üçün işlənilməli olan və mücahidlərə çatmalı olan döyüş qənimətləri .٢ hökumətin ixtiyarına keçdi və hökumət də onları şəxsi rifah istiqamətində sərf etməyə .başladı

.Təqib, həbs olunma, işkəncə, qətl və bəzən də kütləvi soyqırım adi hala çevrilmişdi .٣

Əməvi sülaləsi hakimiyyət başına gəlməmişdən qabaq şiə fiqhinin bir o qədər də .۴ nəzəri cəlb etməməsinə və bütün İslam hökmlərini bilən şiə İmamlarının fiqhi alimlər kimi tanınmamasına baxmayaraq, rəsmi fiqhi qayda-qanunlara zahirdə də olsa, riayət olunurdu. Məsələn, bir mövzu haqqında hökm vermək istərkən, əvvəl Qurana, sonra isə



---

.Biharül-ənvar, c.۴٧, səh.٧٢ [٣۶] -١

Peyğəmbər sünnəsinə müraciət edilirdi. Əgər həmin mövzuya aid bir ayə tapılmasaydı, Peyğəmbər (səlləllahu əleyhi və alih) səhabələrinə üz tutub soruşurdular ki, bu hökm barədə Peyğəmbərdən (səlləllahu əleyhi və alih) bir hədis eşitmisiniz, ya yox? Bu qədər araşdırmadan sonra əgər bir nəticəyə gələ bilmirdilərsə, onda fiqh sahəsində mütəxəssis olan şəxslərin araşdırmaları nəticəsində hökmü təyin edirdilər. Ancaq bu şərtlə ki, verilmiş hökm Quran və Peyğəmbər sünnəsinin əksinə olmasın. Ancaq Əməvilər sülaləsi hakimiyyətə gəldikdən sonra hər hansı bir verilən hökmün Quran və Peyğəmbər sünnəsi ilə zidd olduğu təqdirdə, buna qarşı heç bir reaksiya vermir və bunun qarşısını almırdılar. Belə ki, Müaviyə Peyğəmbərin (səlləllahu əleyhi və alih) buyurduğunun əksinə olaraq Ziyadı qeyri-şəri yolla Əbu Süfyanın oğlu və .özünə qardaş qərar verdi

Bildiyimiz kimi İslam şəriətində dini hökmlərdən kənar iş görmüş şəxslər üçün .۵ “hədlər və diyələr” adlanan bir sıra hökmlər təyin olunmuşdur. Günahkar şəxs həmin hökmlərə əsasən, cəzalandırılmalıdır. Ancaq Əməvi sülaləsi hakimiyyətdə olduğu müddətdə bu hədlərin heç biri günahla uyğunlaşdırılmırdı. Günahkarın cəzası hakimdən asılı idi, bəzi vaxtlar hakim günahkarı əfv edir, bəzi vaxtlar günahsız bir şəxsi .edam etdirir, bəzi vaxtlar isə günahkar üçün həddindən çox cəza təyin edirdi

İslam müqəddəsatları hörmətsizliyə məruz qaldı və müsəlmanlar üçün müqəddəs .۷ hesab olan şeylər təhqir olundu. Belə ki, Məscidül-həram və Kəbə evi viran edildi və Peyğəmbərin (səlləllahu əleyhi və alih) məzar, minbər və məscidinə hörmətsizlik edildi, .habelə, Mədinə camaatı üç gün kütləvi qırğına məruz qaldı

İslam tarixi ərzində ilk dəfə olaraq Peyğəmbər ailəsi kütləvi şəkildə öldürüldü və .۸ .onun qız-gəlinləri əsir götürülərək şəhərbəşəhər gəzdirildi

Cahiliyyət dövrünün əlamətlərindən olan və Peyğəmbərin dövründə pislənilən .۹ mədhiyyə və öyünmə şerləri yenidən adət oldu. Əməvilər sülaləsi dövrünün şairləri xəlifə və ya hakimləri onlarda olmayan sifətlərlə tərifləməyə və onlarda olan mənfi .sifətləri isə ört-basdır etməyə başladılar

Bir sıra dünyatələb və dini satmış alimlər iş başına gələrək xəlifələrin razılığı .۱۰ bahasına özlərinə Allah qəzəbini qazandılar. Onlar öz şəxsi fikirlərinə əsasən, Quran

ayələri və Peyğəmbər hədislərini təfsir edir, xəlifələrin gördüyü işlərə, dediyi sözlərə həqiqət libası geyindirirdilər.

۱۱. Rifah içərisində yaşama, yeyinti məhsulları, pal-paltar, ev-eşik, ev avadanlıqları günbəgün artır, hökumət işləri üçün saraylar, hətta ovlaqlar da artmağa başlayırdı.

۱۲. Şərabxorluq, arvadbazlıq, xoşavazlı kənizlər almaq adət halına çevrilmişdi. İş o yerə çatmışdı ki, Əməvi xəlifələrinin bəzilərinin gündəlik söz-söhbəti ancaq qadın, yemək və şərab barəsində olurdu.(۱)

۱۳. İslam nizam-intizamının ən mühüm əsaslarından biri olan irqi bərabərçilik aradan gedərək öz yerini ərəblərin xeyrinə, digər millətlərin isə zərərinə nəticələnən kobud irqi ayrıseçkiliyə verdi. Halbuki, Quran və Peyğəmbər sünnəsi hər hansı bir ayrıseçkiliyi ləğv etmiş və hörmətli və üstün olmağın ölçüsünü ancaq təqvalı olmaqda qərar vermişdir.

səh:۱۶

---

۱- Əməvi sülaləsinin sonunadək İslamın təhlili tarixi, səh.۲۰۴.

Əməvilər isə ərəb millətini ən üstün millət hesab edərək deyirdilər ki, İslam Peyğəmbəri (səlləllahu əleyhi və alih) ərəb millətindən olduğu üçün ərəblər sair millətlərdən üstündür. Ərəblərin öz içərisində isə Qüreyş qəbiləsi digər qəbilələrdən üstündür. Bu siyasətə əsasən, ərəblər bütün işlərdə əcəm (qeyri-ərəb) millətlərindən üstün tutulurdu. Bəni-Üməyyənin təmtəraq əsasında qurulmuş hökumət sistemi mövliyanı (müsəlman olmuş qeyri-ərəb millətləri) qocalıb əldən düşmüş insanlar kimi satın alır, onları bütün ictimai hüquqlardan məhrum edirdilər. Təbii ki, belə olan halda da, təhqir, hörmətsizlik daima mövliyanın üstündən əskilmirdi. Mövliyalar hər hansı bir abırlı iş və peşədən məhrum idilər. Onların silah düzəltməyə, ata minməyə, ərəblərdən, hətta adı heç bir yerdə çəkilməyən bədəvi ərəblərdən qız almağa ixtiyarları yox idi. Əgər bunu gizli şəkildə etsəydilər, onda qadını kişisindən təlaq aldırıb ayrılmağa məcbur edər, kişini isə şallaqlayıb həbs edərdilər. Hökm vermək, mühakimə yürütmək və rəhbərlik etmək kimi işlər hər bir sahədə ərəblərə məxsus idi və qeyri-ərəbin bu işləri görməyə səlahiyyəti yox idi. Ümumiyyətlə, Əməvi ərəbləri belə fikirləşirdilər ki, onlar ağa olmaq, hökm vermək üçün yaradılmışlar və iş-güc, zəhmət hamısı mövliyaya məxsusdur. Onların mövliyaya qarşı bu cür hərəkəti Abbasilərin Bəni-Üməyyəni süquta uğratmasında böyük rolu olmuş əsas amillərdən biridir. Əməvilərə qarşı qiyamın gedişatında Abbasilər Bəni-Üməyyəni pis tanıtdırmaq və camaatı qiyama qaldırmaq üçün bu amillərdən istifadə edirdilər. Ancaq bu amillərin arasından iki amilin təsiri daha çox idi. Onlardan biri mövliyanın təhqir olunması, digəri isə Peyğəmbər (səlləllahu əleyhi və alih) ailəsinin məzlumiyyəti olmuşdur. Abbasilər bu iki amildən lazımi qədər istifadə etdilər. Bu amillər Abbasiləri hərəkətə gətirən və onları .öz məqsədlərinə nail olmaqda irəli aparan iki əsas amil hesab olunur

**!?Abbasilərin qiyamı İslami mahiyyət daşıyırdımı**

İmam Sadiq əleyhissəlamın həyatında diqqəti cəlb edən məsələlərdən biri də, o Həzrətin Abbasilər qiyamının başçılarının ona beyət etmək təklifini qəbul etməməsidir. Əgər bu məsələyə ötəri və səthi baxsaq, ola bilər belə fikirləşək ki, bu qiyamda məzhəbi fikirlərin daha çox təsiri olmuşdur. Çünki qiyamçıların bütün şüarları İslami şüarlar və bayraqları üzərinə yazılmış sözlərin hamısı Quran ayələri idi. Onlar özlərini elə qələmə verirdilər ki, guya Əhli-beytin (əleyhimussəlam) xeyrinə iş görür və məqsədləri Peyğəmbər (səlləllahu əleyhi və alih) ailəsinin Bəni–Üməyyə və Bəni–

Mərvan tərəfindən axıdılmış nahaq qanının intiqamını almaqdır. Onlar öz qiyamını Əhli-beyt (əleyhimussəlam) ilə əlaqələndirmək istəyirdilər. Düzdür, əvvəl camaatı ona tərəf dəvət etdikləri xəlifənin adını bildirməsələr də, ancaq şüarları belə idi ki, “Biz Məhəmməd (səlləllahu əleyhi və alih) ailəsindən seçilmiş bir şəxsə beyət etmək üçün qiyam etmişik.”(١)

Deyirlər ki, Əbu Müslimin ərəblər arasında da (o özü qeyri-ərəb olmuşdur) çoxlu dost-tanışı, silahdaşı var idi. Onlar Əbu Müslimə beyət edərkən and içib deyirdilər ki, Quran və Peyğəmbər (səlləllahu əleyhi və alih) sünnəsinə əməl etməkdə, Peyğəmbər (səlləllahu əleyhi və alih) ailəsindən seçilmiş və hələ ki, naməlum qalan bir şəxsə itaət etməkdə möhkəm olacaq və öz başçılarına itaət etməkdə hiyləyə yol verməyib onların əmrlərini heç bir söz-söhbətsiz icra edəcəklər. Hətta and içərkən bunu da söyləyirdilər ki, düşmənə



---

١- [٣٧] Doktor Şövqi Zeyf, “Tarixül Ədəbil Ərəbi” (٢), səh. ١٧۶-٢٠٣

qalib gəldikləri təqdirdə, onları ancaq İslam və öz başçılarının qayda-qanunları .əsasında həlak edəcəklər

Qiyamçıların tanınması üçün olan əlamət onların qara paltar geymələri və qara bayraq götürmələri idi. Peyğəmbərin (səlləllahu əleyhi və alih) bayrağı qara olduğu və onların da məqsədləri Peyğəmbərin (səlləllahu əleyhi və alih) dininə qayıtmaq olduğu üçün, ya da məqsədləri Peyğəmbər (səlləllahu əleyhi və alih) ailəsinin intiqamını alıb onlara əzadar olduqlarına görə öz bayraqları üçün qara rəngi seçmişdilər. Bəlkə də, məqsədləri bu olmuşdur ki, özlərini kütləvi qırğınla nəticələnəcək döyüş barədə deyilmiş uzaqgörənliyin aşkar nümunəsini qələmə versinlər. Bu fikrə görə Xorasan tərəfdən qara rəngli bayraqların qalxması zalımlar dövlətinin süqutu və haqq olan (dövlətin yaranması nişanəsidir.(١

Bir sözlə, bunun zahirindən belə başa düşülür ki, Abbasilər qiyamı İslam ehtivalı, .əzəmətli bir qiyam olmuşdur

### Qiyam başçılarının İmam Sadiq əleyhissəlama yazdığı məktublar

Əbu Müslim, İbrahimin ölümündən sonra İmam Sadiq əleyhissəlama belə bir məktub yazdı: "Mən camaatı Əhli-beytlə dostluğa dəvət edirəm, əgər razısınızsa, xəlifə olmağa sizdən yaxşı bir adam yoxdur." İmam Sadiq (əleyhissəlam) onun cavabında yazdı: "Nə (sən bizim dostlarımızdansan, nə də zəmanə bizim zəmanəmizdir."(٢

Fəzli Katib yazır: "Bir gün İmam Sadiq əleyhissəlamın yanında olarkən Əbu Müslimdən bir məktub gəldi. İmam Sadiq (əleyhissəlam) qasidə buyurdu: "Sənin gətirdiyin (məktubun cavabı yoxdur, çıx get!"(٣

Həmçinin, sonralar "vəziri-Ali-Məhəmməd (səlləllahu əleyhi və alih)" ləqəbi almış Əbu Sələmeyi Xəllal, İbrahimin ölümündən sonra vəziyyətin onun xeyrinə olmadığını görüb bu qərara gəldi ki, onlardan (Abbasilərdən) ayrılıb Əli əleyhissəlamın övladlarına qoşulsun. Bu məqsədlə Ələvilərin (Əli əleyhissəlamın nəslinin) üç böyük nümayəndələri olan Cəfər ibn Məhəmməd Əs-Sadiq (əleyhissəlam), Abdullah ibn Həsən ibn Əli ibn Əbu Talib və Ömər Əl-Əşrəf ibn Zeynül-abidinə məktub yazıb onu dostlarından birinə verərək dedi ki, əvvəl Cəfər ibn Məhəmməd Əs-Sadiq əleyhissəlamın yanına get, əgər

o qəbul etsə, digər iki məktubu aradan apar, yox əgər o qəbul etməsə, Abdullahın yanına get, əgər o da qəbul etməsə, Ömərin yanına get! Əbu-Sələmeyi Xəllalın qasidi əvvəl İmam Sadiq əleyhissəlamın yanına gəlib məktubu ona verdi. İmam Sadiq (əleyhissəlam) buyurdu: "Başqasının tərəfdarı olan Əbu Sələmə ilə mənim nə işim var?" Qasid dedi: "Məktubu oxuyun!" İmam Sadiq (əleyhissəlam) öz qulluqçusuna dedi ki, çırağı onun yanına gətirsin. Sonra məktubu oda atıb yandırdı. Qasid soruşdu: "Ona cavab yazmırsan?" İmam Sadiq (əleyhissəlam) buyurdu: "Bu gördüyün elə onun cavabı ".idi

Əbu Sələmənin qasidi İmam əleyhissəlamın yanından çıxıb Abdullahın yanına gedərək məktubu ona verdi. Abdullah məktubu oxucaq onu öpüb dərhal ata minərək İmam Sadiq əleyhissəlamın yanına gəlib dedi: "İndicə bizim Xorasandakı şiələrimizdən birinin gətirdiyi bu məktub Əbu Sələmə tərəfindən yazılıb. O məni xilafət başına keçməyə dəvət edir." İmam Sadiq (əleyhissəlam) Abdullaha buyurdu: "Xorasan camaatı nə vaxtdan sənin şiələrin olmuşdur? Əbu Müslimi onların yanına sən göndərmisən? Bir



---

.Biharül-ənvar, c.۵۲, səh.۲۱۷-۲۲۹ [۳۸] -۱
.Əl-Miləlu vən-nihəl, c.۱, səh.۱۵۴ [۳۹] -۲
.Ər-Rəvzətu minəl-kafi, səh.۲۱۴ [۴۰] -۳

halda ki, nə sən onları tanıyırsan, nə də onlar səni, bəs, onda necə sənin şiələrindirlər?” Abdullah dedi: “Deməli, sənin sözündən belə çıxır ki, sənin bu barədə başqa fikrin var?” İmam Sadiq (əleyhissəlam) buyurdu: “Allah Özü bilir ki, mən hər bir müsəlman barədə yaxşı fikirləşməyi özümə vacib bilirəm, necə ola bilər ki, indi onu sənə rəva bilməyim? Abdullah, bu puç arzuları ağlından çıxart, bunu bil ki, hakimiyyət Bəni-Abbasın ”.(Abbasilərin) olacaqdır. Bu məktubdan mənim üçün də gəlmişdir

.Abdullah narahat halda İmam Sadiq əleyhissəlamı tərk edib geriyə döndü

Ömər ibn Zeynül-abidin də Əbu Sələmənin məktubuna mənfi cavab verdi. Onun məktubunu qəbul etməyib dedi: “Mən heç məktubu yazanı tanımıram ki, ona cavab da (yazım.”(١

Elə ki qələbə bayraqları dalğalanmağa başlayıb zəfər əlamətləri müşahidə olundu Əbu-Sələmə yenidən İmam Sadiq əleyhissəlama məktubla bildirdi: “Bizim ixtiyarımızda yetmiş min döyüşçü var, indi öz mövqeyini müəyyən et!” İmam Sadiq ((əleyhissəlam) yenə də əvvəlki cavabını verdi.(٢

Əbu Bəkr Həzrəmi nəql edir ki, bir gün Əban ibn Təğliblə birlikdə İmam Sadiq əleyhissəlamın yanına getmişdik. O vaxt artıq Xorasanda qara bayraqlar (Abbasilərin bayraqları) dalğalanırdı. İmam Sadiq əleyhissəlama dedik: “Vəziyyətin gedişatı barədə nə fikirləşirsiniz?” O buyurdu: “Öz evinizdə oturun, elə ki gördünüz biz kiminsə başına (toplaşmışıq, silah götürüb bizə tərəf gəlin.”(٣

İmam Sadiq (əleyhissəlam) başqa bir söhbətində öz səhabələrinə buyurmuşdur: “Danışığınıza fikir verin və evinizdən eşiyə çıxmayın, çünki sizə məxsus olan şey (əsl (İslam hökuməti) bu tezliklə sizə nəsib olmayacaq...”(٤

### ?Nə üçün İmam Sadiq (ə) Abbasilərin başçılarının təklifini rədd etdi

Deyilənlərə diqqət yetirərkən ilk baxışda İmam Sadiq əleyhissəlamın Əbu Müslim və Əbu Sələmənin təklifləri qarşısındakı mövqeyi bir az anlaşılmazlıq yaradır. Ancaq bu məsələyə bir az diqqətlə yanaşdıqda, İmam əleyhissəlamın belə bir mövqedə durmasının səbəbi çox aydın şəkildə məlum olur. İmam Sadiq (əleyhissəlam) çox yaxşı bilirdi ki, qiyam başçılarının hakimiyyətə gəlməkdən başqa bir fikri yoxdur. Əhli-beytin

tərəfdarlığı şüarını irəli sürmələri isə müxtəlif kütlələri özlərinə tərəf cəlb etməkdən .ötrüdür

Tarixi rəvayətlər sübut edir ki, Xorasan qoşunu Kufəyə gəldikdən sonra Əbu Sələmeyi Xəllal siyasi işləri öz əlinə alıb ətrafındakı siyasi və nizami təşkilatları genişləndirməyə başladı. O istəyirdi ki, Əli əleyhissəlamın nəslindən bir nəfər xəlifə seçilməklə dövlətin əsas qüdrətini özü ələ alıb son qərarı özü çıxartsın, xəlifənin ancaq adı olub zahirdə (görünsün.(۵

İmam Sadiq (əleyhissəlam) bilirdi ki, Əbu Müslim və Əbu-Sələmə Əhli-beytdən olan tanınmış bir nəfər rəhbər təyin etməklə öz məqsədlərinə çatmaq fikrindədirlər. İmam (əleyhissəlam) bilirdi ki, onlar onu İmam kimi tanımır. Əgər onu İmam kimi tanısaydılar, onda eyniməzmunlu məktubu Peyğəmbər (səlləllahu əleyhi və alih) ?ailəsindən olan üç nəfərə niyə yazırdılar



---

.Mürucuz-zəhəb, c.۳, səh.۲۵۳-۲۵۴ [۴۱] -۱

.Biharül-ənvar, c.۴۷, səh.۱۳۳ [۴۲] -۲

.Biharül-ənvar, c.۵۲, səh.۱۳۹ [۴۳] -۳

.Biharül-ənvar, c.۵۲, səh.۱۳۹ [۴۴] -۴

.Təbiətüd-də’vətil-Əbbasiyyə, səh.۲۲۶ [۴۵] -۵

İmam Sadiq (əleyhissəlam) son dərəcə qətiyyətlə bilirdi ki, qiyamın əsas təşkilatçıları Abbasilərdir, onların da hakimiyyətə gəlməkdən başqa bir məqsədləri yoxdur. Əbu Müslim və Əbu Sələmə kimilər isə yalnız bir vasitədirlər. İmam Sadiq (əleyhissəlam) bilirdi ki, Abbasilər daha onlara lazım olmayan və yaxud da, onlara mane olan şəxsləri tezliklə aradan götürəcəklər. Elə belə də oldu. Əbu Müslim, Əbu Sələmə, Süleyman ibn Kəsir və tezliklə başqaları aradan götürüldülər. İmam (əleyhissəlam) qətiyyətlə bilirdi ki, Əbu Müslim və Əbu Sələmə kimilər aldadılmışlardır və onlar heç də İslam və Əhli-beyt yolunda deyillər. Buna görə də, onlarla həmkarlıq etməyə və onların gördüyü işlərə şəri bəraət verməyə razı olmurdu. Çünki qiyam başçıları onun məktəbinin şagirdləri deyildilər. Onlar intiqam, hakimiyyətə gəlmək və eləcə də pis işlər uğrunda çox ifrata varmış və elə işlər görmüşdülər ki, özünü müsəlman bilən şəxs onların .gördüyü bu işləri əsla təsdiqləyə bilməzdi

## İbrahimin Əbu Müslimə söylədiyi dəhşətli vəsiyyətlər

Tarixə nəzər saldıqda Abbasilər qiyamının əvvəllərində İbrahimin Əbu Müslim .Xorasaniyə yazdığı vəsiyyətin mətninə rast gəlirik

Əmiri-Ali-Məhəmməd(١) (səlləllahu əleyhi və alih) ləqəbi almış tanınmış qəhrəman Əbu Müslim Xorasani Məkkəyə səfəri zamanı İbrahimlə görüşdü. İbrahim öz vəsiyyətlərini ona deyib sonralar Abbasilərin simvolu olmuş qara bir bayrağı da ona verərək onu Xorasanda qiyam qaldırmaq üçün göndərdi. Bu vəsiyyət İbrahim, Əbu Müslim və sair .qiyam başçılarının əsl simasını açıb söylədiyi üçün onu olduğu kimi burada qeyd edirik

İbrahim bu fərmanın (vəsiyyətin) əvvəlində Əbu Müslimi - bu təcrübəsiz cavanı daha çox aldatmaq üçün deyir: "Sən bizim ailəmizdən olan bir şəxssən. Sənə nə deyirəmsə, ona əməl et... (Bizə qarşı vəfalı olmaqda) kimdən şübhələnsən, onu qətlə yetir, əgər bacarsan, Xorasanda bir nəfər də olsun belə ərəb qoyma (Xorasanda olan bütün (ərəbləri öldür.) Hətta beş qarış boyunda bir uşaqdan da şübhələnsən, öldür."(٢)

.Beləliklə, İbrahim öz vəsiyyətində Əbu-Müslimə açıq-aşkar qətl fərmanı verir

Muqrizi deyir: "Əgər İbrahim Əbu-Müslimi qeyri-müsəlman bir vilayətin əhalisini İslama dəvət etmək üçün göndərsəydi, bu cür bir hökm verməsi əsla caiz olmazdı.

Halbuki, o, Əbu-Müslimi müsəlman vilayətinə göndərib ona belə bir qırğın əmri verdi.”(۳)

### Əbu Müslimin cinayətləri

Çox təəssüflə qeyd etməliyik ki, Əbu Müslim verilmiş bu əmrə son dərəcə xırdalıqlara qədər əməl edib onu həyata keçirtdi. Hətta iş o yerə çatdı ki, o, Yafeinin dediyinə görə öz dövrünün Həccacına çevrilib Abbasilərin hakimiyyətinin möhkəmlənməsi uğrunda saysız-hesabsız adamlar qırdı.(۴)



---

۱- [۴۶] İbn Əsir, “Əl-kamil fit-tarix” c. ۵, səh. ۴۳۶; İbn Kəsir, “Əl-bidayə vən-nihayə”, ۲-ci çapı, c. ۱۰, səh. ۵۴.

۲- [۴۷] Əl-Kamilu fit-tarix, c.۵, səh.۳۴۸; Əl-İbər (farsca tərcümə), c.۲, səh.۱۶۷; Ən-nizahu vət-təğasümu fima bəynə Bəni Üməyyə və Bəni Haşim, səh. ۶۶; Əl-bidayə vən-nihayə, c. ۱۰, səh. ۲۸

۳- [۴۸] Ən-nizau vət-təxasümu fima bəynə Bəni Uməyyə və Bəni Haşim, səh.۶۷.

۴- [۴۹] Mir’atül-cinan, c.۱, səh.۲۸۵.

Tarixçilər yazırlar: “Əbu Müslimin öz hakimiyyəti dövründə öldürdüyü adamların sayı altı yüz min nəfər olmuşdur.”[1]

Əbu-Müslim özü bu cinayətlərinə etiraf edirdi. O, Mənsur tərəfindən hədələnərkən ona bir məktub yazıb bildirdi: “Qardaşın (Səffah) mənə əmr verdi ki, qılınc çəkib şübhələndiyim şəxsi həbs edim, kiçik bir ittiham vasitəsilə qətlə yetirim, heç bir bəhanəni qəbul etməyim. Mən də onun əmrinə itaət edib Allahın hörmət olunmasını vacib buyurduğu bir çox şeylərin hörmətini pozdum, Allahın hörmətinin saxlanılmasını vacib buyurduğu bir çox qanlar axıtdım, hakimiyyəti onların əlindən alıb başqasına verdim...”[2]

Mənsur da onun dediklərini təsdiqlədi. O, Əbu Müslimi edam etməzdən qabaq onun törətdikləri cinayətləri sayarkən qeyd etdi ki, nə üçün altı yüz min nəfəri əzab-əziyyətlə qətlə yetirdin? Əbu-Müslim bu dəhşətli faciəni inkar etmədən cavab verdi ki, bunların hamısını sizin hakimiyyətinizin möhkəmlənməsi üçün yerinə yetirmişəm.[3]

Başqa bir yerdə Əbu Müslim döyüşənlərdən başqa öldürdüyü şəxslərin sayını yüz min nəfər qeyd edir.[4]

Əbu Müslim öz keçmiş dostlarına belə rəhm etmirdi. Belə ki, “Vəziri-Ali-Məhəmməd[5] (səlləllahu əleyhi və alih)” ləqəbi ilə tanınmış, öz dostu və həmkarı, Abbasilərin qalib gəlməsində böyük rolu olmuş, ümumiyyətlə, qiyamın əsas iqtisadi dayağı olmuş Əbu Sələmeyi-Xəllalı öldürdü.[6]

Buna əsasən, əgər tarix səhifələrində Əbu Müslim həccə gedərkən bədəvi ərəblərin onun yolundan qaçıb uzaqlaşdığını oxuyuruqsa, heç də təəccüblənməməliyik. Çünki onlar Əbu Müslimin qəddarlığı barədə çox eşitmişdilər.[7]

### Seçim və proqramlaşdırma

İmam Sadiq əleyhissəlamın Abbasilər qiyamının başçılarının təklifini qəbul etməməsi barədə dediklərimizi qısa şəkildə belə demək olar ki, təklif edənlər həqiqi və əsl bir qiyam üçün lazım olan səlahiyyətə malik olmamışlar. Onlar əsas qüvvələr deyildi ki, onların vasitəsi ilə əsl İslami bir hərəkata başçılıq etmək mümkün olsun. Əgər İmam Sadiq əleyhissəlamın ixtiyarında kifayət qədər əsas qüvvə olsaydı, şübhəsiz ki, İmam

qiyamın başçılığını öz öhdəsinə götürərdi. Başqa sözlə desək, millətin fikri və əməli vəziyyətindən, eləcə də siyasi-ictimai durumundan xəbərdar olan İmam Sadiq (əleyhissəlam) siyasi mübarizə aparmaq üçün əlində olan imkan və qüdrəti silahlı qiyam edib əsl İslam hökuməti yaratmaq üçün qələbə qazanmağa kafi bilmir və imkanatın məhdud olduğunu yaxşı bilirdi. Çünki əsl İslam hökuməti qurmaq üçün təkcə nizami qüvvə hazırlamaq kifayət etmir, əksinə, ondan qabaq İmamın məsum, iman və mərifət sahibi olduğuna sidq ürəkdən inanan, onun böyük fikirlərini başa düşən, hakimiyyət sahəsində onun qurduğu sistemi müdafiə edib millət üçün ələ gəlmiş .nəticələri qoruya bilən əqidəvi bir ordu qurmaq lazım idi



---

.Əl-Bidayətu vən-nihayə, c.۱۰, səh.۷۲; Əl-Kamilu fit-tarix, c.۵, səh.۲۷۶ [۵۰] -۱

.Əl-İmamus-Sadiq vəl-məzahibül ərbəə, c.۲, səh.۵۳۳ [۵۱] -۲

.Təbiətu-də’vətil-Əbbasiyyə, səh.۲۴۵ [۵۲] -۳

.Tarixi-Yə’qubi, c.۳, səh.۱۰۵ [۵۳] -۴

.Əl-kamilu fit-tarix, c. ۵, səh. ۴۳۶; Əl-bidayə vən-nəhayə, c. ۱۰, səh. ۵۴ [۵۴] -۵

.Vəfəyatül-ə’yan, c.۲, səh.۱۹۶ [۵۵] -۶

.Vəfəyatül-ə’yan, c.۳, səh.۱۴۸ [۵۶] -۷

İmam Sadiq əleyhissəlamın səhabələrindən biri ilə etdiyi söhbət də yuxarıda deyilənləri təsdiq edir. Südeyr Seyrofi deyir ki, İmam Sadiq əleyhissəlamın yanına gedib dedim: “Nə üçün (sakit) oturmusunuz?” İmam Sadiq (əleyhissəlam) buyurdu: ”?“Südeyr, məgər nə hadisə baş vermişdir

”.Dedim: “Dost, şiə və tərəfdarlarının çoxluğu barədə deyirəm

?Səncə onlar neçə nəfər olar —

.Yüz min nəfər —

?Yüz min nəfər —

.Bəli, bəlkə də iki yüz min —

?İki yüz min —

”.Bəli, bəlkə də dünyanın yarısı —

Bu söhbətdən sonra İmam Sadiq (əleyhissəlam) Südeyrlə birlikdə Yənbə adlı bir yerə gələrək orada bir sürü keçi balası görüb buyurdu: “Südeyr, əgər bizim dost və (tərəfdarlarımızın sayı bu keçi balaları qədər olsaydı, biz sakit oturmazdıq.”(١

Bu hədisdən belə nəticəyə gəlirik ki, İmam Sadiq əleyhissəlamın fikri qətiyyən belə olmuşdur ki, təkcə hakimiyyətə gəlmək kifayət etmir, nə qədər ki, hökumət camaatın müxtəlif kütlələri tərəfindən himayə olunmur, köhnə rejimi aradan götürüb yeni - əsl İslami rejimi qurmaq qeyri-mümkündür. Xalq kütlələri elə olmalıdırlar ki, hökumətin məqsəd və fikirlərini başa düşməli, hökumətin fikri ilə həmfikir olmalı, onun irəliləməsi sahəsində addım atmalı, camaat üçün hökumətin tutduğu mövqeləri açıqlamalı və çətinliklərlə üzləşdikdə, dözümlü olub səbr etməlidirlər. İmam Sadiq əleyhissəlamın söhbətindən belə başa düşürük ki, əgər o Həzrətin ixtiyarında düşmənə silahlı mübarizə yolu ilə qalib gəldikdən sonra İslami məqsədlərini həyata keçirə biləcək dost və tərəfdarları olsaydı, yəqin ki, silahlı mübarizəyə başlayardı. Ancaq zamanın şərait və vəziyyəti İmam əleyhissəlama bu fürsəti vermirdi. Çünki bu iş elə bir iş idi ki, əgər yüz faiz məğlub da olmasaydı, yenə onun nəticəsi zəmanət olunmamışdı. Başqa sözlə

desək, mövcud olan belə şəraitlə hərəkat məğlubiyyətə uğramasaydı da, onun qələbə ilə nəticələnəcəyi də qəti deyildi.(۲)

### İmam Sadiq (əleyhissəlam) Abbasilərlə üz–üzə

Yuxarıda qeyd etdiyimiz kimi Bəni-Abbas Bəni-Üməyyə ilə mübarizənin əvvəllərində (Bəni-Haşimi) Peyğəmbər (səlləllahu əleyhi və alih) ailəsini himayə etmək, haqq-ədalət qurmaq şüarlarını verirdilər. Həqiqətən də, bir tərəfdən Əməvilərin hakimiyyəti dövründə Peyğəmbər (səlləllahu əleyhi və alih) ailəsinin məzmlumluğu müsəlmanların ürəklərini yaraladığından, digər tərəfdən də, onlar İslam hakimiyyəti adı altında heç bir zülm etməyi əsirgəmədiyindən, Bəni-Abbas camaatın Bəni-Üməyyəyə qarşı olan ciddi narazılığından istifadə edib Peyğəmbər (səlləllahu əleyhi və alih) ailəsini himayə etmək şüarı adı altında işin əvvəlində xalqın etimadını özlərinə cəlb edə bildilər. Ancaq onların Peyğəmbər (səlləllahu əleyhi və alih) ailəsinə qarşı zülmün, haqsızlığın aradan qaldırılması və haqq-ədalətin öz yerini tutacağı barədəki vədləri həyata keçmədi heç, üstəlik çox çəkmədi ki, Bəni-Üməyyənin qeyri-İslami işləri bu dəfə bir az da, artıqlaması ilə icra olunmağa başladı. İş o yerə çatdı ki, camaat yenidən Bəni-Üməyyə hakimiyyətinin qayıtmasını



---

۱- [۵۷] Əl-Usulu min əl-kafi, c.۲, səh.۲۴۲.

۲- [۵۸] İmamların həyatının təhlili, səh.۱۸۳-۱۸۵.

arzuladı. Necə ki, Əbu Əta Sindi adlı bir şairin bu həqiqətlə bağlı söylədiyi şe`rindəki :misralar diqqəti özünə cəlb edir

,Kaş bir daha Bəni-Üməyyənin zülm və azğınlığı geri dönəydi

(Abbaislərin haqq-ədaləti isə cəhənnəmə gedəydi! (١

Səffahın hakimiyyət dövrü qısa və ilk Abbasi xəlifəsinin hakimiyyət dövrü olduğundan, o vaxt hələ Bəni-Abbas hakimiyyətinin dayaqları çox da möhkəmlənmədiyi üçün onun dövründə camaata bir o qədər də zülm olunmurdu. Peyğəmbər (səlləllahu əleyhi və alih) ailəsi də çox təzyiqlərə məruz qalmırdı. Ancaq Mənsur Dəvaniqinin hakimiyyətə gəlişi ilə zülm artdı. Mənsur nisbətən uzun müddət, yəni təxminən iyirmi bir il İmam Sadiq əleyhissəlamın müasiri olduğu üçün onun bu müddətdə göstərdiyi təzyiqlər və .törətdiyi cinayətlər barədə bir az açıqlamalar veririk

### İqtisadi təzyiq siyasəti

İkinci Abbasi xəlifəsi) Əbu Cəfər Mənsur Dəvaniqi çox zalım, qəddar, daşürəkli bir) şəxs olmuşdur. O, İslam cəmiyyətini bədbəxtliyə sürükləmiş, camaatı boğaza yığmış və kiçik bir müxalifətə belə, qılıncla cavab verirdi. Mənsur zalım olmasından əlavə, həm də həddən artıq tamahkar,(٢) paxıl, dardüşüncəli bir şəxs olmuş və Abbasi xəlifələri arasında paxıllıq və tamahkarlıq üzrə ad çıxarmışdı. Tarixi qaynaqlarda onun həddən artıq paxıllıq və tamahkarlığı barədə çoxlu dastanlar qeyd olunmuşdur. Ancaq onun cəmiyyətdə yaratdığı maliyyə çətinliklərini və insanı əldən salan iqtisadi təzyiqlərini təkcə onun paxıl və tamahkar olması ilə əlaqələndirmək olmaz. Çünki o, öz hakimiyyəti dövründə cəmiyyətin iqtisadi vəziyyətini iflic halına salaraq camaatı həyat səhnəsində məhv etdi. O, təkcə müsəlmanların ümumi malını hökumət xəzinəsində yığıb toplamaqla onu abadlıq işləri və camaatın rifahı sahəsində xərcləməmiş, üstəlik camaatın əlində olanı da, güclə onlardan alıb heç kimdə az da olsa, belə pul qoymamışdı. Bəzi tarixçilərin dediyinə görə Mənsurun bu yolla topladığı mal-dövlətin (dəyəri səkkiz yüz milyon dirhəmə çatırdı.(٣

Bəli, bütün ölkədə icra edilən bu ətraflı proqram elə bir proqram deyildi ki, onu təkcə Mənsurun son dərəcə paxıllıq və tamahkarlığı ilə əlaqələndirmək mümkün olsun. Əldə

olan sübutlar göstərir ki, cəmiyyətdə iqtisadi və maliyyə çətinlikləri yaratmaq qabaqcadan hazırlanmış və Mənsurun xüsusi məqsədləri əsasında qurulmuş bir siyasət olmuşdur. Mənsurun bu çirkin siyasətdən məqsədi bu olmuşdur ki, qoy camaat həmişə ac, ehtiyac içərisində olub daima ona göz diksin və belə olduğu bir halda da, ancaq qarınlarını doyurmaq fikrində olub daha böyük ictimai hadisələrlə məşğul olmağa macal tapmasın. Mənsur bir gün öz dost-tanışının bir qisminin yanında camaatı ac saxlamaqda olan məqsədini uca səslə belə bəyan etdi: "Bədəvi ərəblər öz misallarında yaxşı demişlər ki, itini həmişə ac saxla, qoy çörək tapmaq üçün daima sənin ardınca düşsün." Bu zaman Mənsurun bu təhqiramiz ifadəsindən bərk narahat olmuş bir şəxs dedi: "Qorxuram ki, başqa bir şəxs həmin itə bir parça çörək versin, it də çörəkdən ötəri onun ardınca düşüb səndən əl çəksin."(۴)



---

۱- [۵۹] Doktor Şövqi Zeyf, "Tarixül Ədəbil Ərəbi" (۲), səh. ۳۴۰.

۲- [۶۰] Qaynaqlarda onu "pul atası" adlandırmışlar.

۳- [۶۱] Tarixi-Yə'qubi, c.۳, səh.۱۲۵.

۴- [۶۲] Həyatül-İmam Musa ibn Cə'fər, c.۱, səh.۳۶۹.

Mənsur öz hakimiyyəti dövründə təkcə özünün bu çirkin aclıq siyasəti ilə kifayətlənmir, üstəlik bu siyasəti oğlu Mehdiyə də tövsiyə edirdi. O, oğlu Mehdiyə etdiyi vəsiyyətlərin birində deyir: "Mən camaatı müxtəlif yollarla özümə tabe etmişəm. İndi camaat üç qisimdir: Bir dəstəsi ac-yalavacdır və həmişə ehtiyac əllərini sənə tərəf uzadacaq. Bir dəstəsi qaçaq düşüb həmişə öz canlarını qorumaq hayındadır. Üçüncü dəstə isə həbsdədir və öz azadlıqlarını yalnız sənin əfv və mərhəmətində arzulayır. Elə ki hakimiyyətə gəldin, camaat üçün rifah və asayiş meydanını çox açıq qoyma."(١)

Bu həqiqətlər göstərir ki, bu proqram Mənsurun hakimiyyətinin möhkəmlənməsi məqsədilə icra olunurmuş. Məqsəd isə dövlət mülkiyyətində olan mal-dövlətdən qənaətlə istifadə etmək deyil, mübariz qüvvələri zəiflədib aradan götürməklə camaatın müxalifət sədalarını yatırmaq olmuşdur.

**Qırğın, qantökmə siyasəti**

Mənsurun antiislam siyasəti təkcə cəmiyyəti aclıqda saxlamaq, onların hüquqlarını kəsməklə kifayətlənmir, iqtisadi və maliyyə çətinliklərindən əlavə cəmiyyətdə dəhşətli bir qorxu da hökm sürürdü. Onun iş başına təyin etdiyi hakimlər çoxsaylı işkəncə və qətllər həyata keçirir, hər gün neçə nəfər bu vəhşiliyin qurbanı olurdu. Bir gün Mənsurun əmisi ona dedi: "Sən camaatın üstünə elə qəzəb və nifrətlə hücum çəkmisən ki, sanki sənin qulağına heç rəhm sözü dəyməyib." Mənsur onun cavabında deyir: "Hələ Bəni-Mərvanın sümükləri çürüməyib, Əbu Talib nəslinin qılıncı qınına girməyib. Biz indi dünənəcən bizə adi gözlə, bu gün isə xəlifə gözü ilə baxan bir camaatın arasındayıq. Buna görə də, bizim heybətimiz ancaq rəhmin və əfvin unudulması və zülmün həyata keçməsi ilə yadlarda qalacaq."(٢)

Düzdür, bu siyasət bütün xilafət ərazisində hökm sürürdü, lakin Mədinə şəhəri daha çox təzyiqə məruz qalırdı. Çünki Mədinə əhalisi elə ilk günlərdən İslam qayda-qanunları ilə yaxından tanış olduğu üçün Mənsurun hökuməti kimi hər hansı bir azğın hökumətin tabeçiliyinə keçmək istəmir, hər hansı bir hökmü İslam hökmü adı ilə qəbul etmirdi. Bundan da əlavə, Peyğəmbərin (səlləllahu əleyhi və alih) vəfatından sonra Mədinə şəhəri əsasən, İslamın böyük rəhbərlərinin moizə iqamətgahı olmuş, digər tərəfdən də, hər biri öz dövrünün İslamını qoruyub saxlamaq və camaata rəhbərlik

etmək vəzifəsini daşıyan İmamlar səkkizinci İmama qədər bu şəhərdə olmuş, onların burada olması daima Mədinə müsəlmanlarının İslami hərəkəta başlamalarına səbəb .olmuşdur

Mənsurun hakimiyyəti dövründə İmam Sadiq (əleyhissəlam), o şəhid olduqdan sonra da onun əziz oğlu İmam Kazim (əleyhissəlam) İslami mübarizələr rəhbəri kimi, Mədinə şəhəri isə zalım xəlifələrin özbaşınalıqlarına qarşı aparılan əsl İslami hərəkat mərkəzi .hesab olunurdu

### Mədinə iqtisadi blokadada

İmam Həsən əleyhissəlamın nəvəsi) "Nəfsi Zəkiyyə"(۳) adı ilə məşhur olmuş) Məhəmməd ibn Abdullah ibn Həsənin qiyamından sonra İmam Sadiq əleyhissəlamın həyatının sonlarında Mənsur Mədinə şəhərində baş vermiş qiyamı yatırtmaq üçün Riyah



---

۱- Tarixi-Yə'qubi, c.۳ səh.۱۳۳.
۲- [۶۴] Əl-İmamus-Sadiq vəl-məzahibül ərbəə, c.۱-۲, səh.۴۸۰.
۳- [۶۵] Bu fəsilin sonunda Nəfsi Zəkiyyənin qiyamına ayrıca toxunacayıq.

ibn Osman adlı çox zalım, qaniçən və rəhmsiz bir şəxsi Mədinəyə vali təyin etdi. Riyah Mədinəyə gəldikdən sonra camaatı bir yerə toplayıb xütbə oxuyaraq xütbənin əsnasında dedi: “Ey Mədinə camaatı! Mən əfi oğlu əfiyəm. Mən sizin şəhərinizi xarabaya çevirən, kişilərinizi qıran Müslim ibn Üqbənin qardaşı oğluyam. And olsun Allaha, əgər təslim olmasanız, sizin şəhərinizi alt-üst edəcəyəm. Belə ki, daha onda ”.həyatdan əsər-əlamət qalmayacaq

Bu zaman müsəlmanlardan bir dəstəsi yerlərindən qalxaraq etiraz edib dedilər: “Öz adını İslam tarixinə qara sabiqə ilə yazdırmış və atası günah işlətdiyinə görə iki dəfə cəzalandırılmış sənin kimi bir şəxs belə bir iş görə bilməz. Biz sənə bu cür iş görməyə icazə verməri k.” Riyah Mənsura xəbər göndərdi ki, xalq etiraz edib xəlifənin əmrinə tabe olmur. Mənsur onun vasitəsilə Mədinə əhalisinə təhdidamiz bir məktub yazıb bildirdi ki, əgər öz müxalifətçiliklərini davam etdirsələr, ticarət yollarını həm sudan, həm qurudan onların üzünə bağlamaqla onları iqtisadi blokadaya alacaq və nizami qoşun göndərib onların həyatına son qoyacaqdır. Riyah camaatı məscidə yığıb minbərə qalxaraq xəlifənin məktubunu oxumağa başladı. Heç məktub oxuyub qurtarmamışdı ki, hər tərəfdən camaatın etiraz fəryadı ucaldı və camaatın qəzəbi cuşa gəldi. Camaat onu elə minbərin üstündəcə daşa basdı. O isə canını qurtarmaq üçün bir (təhər aradan çıxıb gizləndi...(١

Mənsur bu hadisədən sonra öz hədələmələrini həyata keçirib ticarət üçün olan gediş-gəliş yolunu bağlayaraq Mədinəni iqtisadi blokadaya aldı. Bu blokada onun oğlu Mehdi (Abbasinin hakimiyyəti dövrünədək davam etdi.(٢

### İmam Sadiq (əleyhissəlam) və Mənsur

Əbu Cəfər Mənsur Dəvaniqi İmam Sadiq əleyhissəlamın siyasi fəaliyyətindən çox narahat idi. İmam əleyhissəlamın xalq kütlələri tərəfindən sevilməsi və elmi əzəməti Mənsurun bu nigarançılığını daha da artırırdı. Buna görə də, o, bir bəhanə düşcək tez İmam Sadiq əleyhissəlamı İraqa(٣) çağırtdırır və onu qətlə yetirmək üçün bir plan çəkirdi. Ancaq hər dəfə bir vasitə ilə təhlükə İmam əleyhissəlamın müqəddəs (vücudundan sovuşurdu.(٤

Mənsur Mədinə şiələrini bərk nəzarət altına almışdı. Onun Mədinədə bir sıra casusları

var idi ki, onlar İmam Sadiq əleyhissəlamın dostları ilə əlaqə saxlayan şəxslərin boynunu vururdular.(5)

İmam Sadiq (əleyhissəlam) öz dostlarını (şiələrini) xilafət mərkəzi ilə həmkarlıq etməkdən çəkindirirdi. Bir gün İmam əleyhissəlamın dostlarından biri soruşur: "Bizlərdən bəzilərimiz elə vaxt olur ki, dolanışığı çətinləşir və onlara bunlar (Bəni-Abbas) üçün ev tikib, quyu qazıb pul almaq təklifi olunur. Sizin fikrinizcə bu iş necədir?" İmam Sadiq (əleyhissəlam) buyurur: "Mən heç razı deyiləm ki, onlar üçün bir düyün belə düyünləyim, yaxud bir tuluğun ağzını belə bağlayım. Baxmayaraq ki, bu işin müqabilində mənə çoxlu pul verəcəklər. Çünki zalımlara kömək edən şəxsləri Qiyamət günü oddan olan pərdə ilə hasarlanmış bir yerə yığacaqlar və bu zaman Allah onların barəsində hökm verəcək."(6)



---

1- [66] Tarixi-Yə'qubi, c.3, səh.115-144.

2- [67] Əl-Kamilu fit-tarix, c.5, səh.551.

3- [68] Abbasilərin xilafət mərkəzi İraqın Bağdad şəhəri olmuşdur.

4- [69] Biharül-ənvar, c.47, səh.162; 212.

5- [70] İxtiyaru mə'rifətir-rical, səh.282.

6- [71] Vəsailuş-şiə, c.12, səh.129.

İmam Sadiq (əleyhissəlam) şiələri mübahisəli məsələləri həll etmək üçün bəni-Abbas xəlifələrinin təyin etdiyi qazıların yanına getməyə qoymayaraq həmin qazılar tərəfindən verilmiş hökmə əməl etməyi vacib bilmirdi. İmam (əleyhissəlam) həmçinin, fəqih və hədisçilərə xəbərdarlıq edirdi ki, hökumətə tabe olmasınlar. İmam (əleyhissəlam) onlara buyururdu ki, fəqihlər Peyğəmbərin (səlləllahu əleyhi və alih) canişinləridirlər. Əgər görsəniz ki, onlar xəlifələrə tərəf üz tutublar (zalımlarla həmkar və əlbir olublar) onlara qarşı pis fikirdə olun, onlara inanmayın.(١)

Bir gün Mənsur Dəvaniqi İmam Sadiq əleyhissəlama məktub yazır ki, nə üçün başqaları kimi sən də bizim yanımıza gəlmirsən? İmam Sadiq (əleyhissəlam) onun cavabında yazır: “Bizim (dünyəvi cəhətdən) elə bir şeyimiz yoxdur ki, ona görə sənə ümid bəsləyək. Sənin nə elə bir nemətin vardır ki, ondan ötrü gəlib səni təbrik edək, nə də özünü müsibət və bəla içərisində görmürsən ki, gəlib ondan ötrü sənə başsağlığı verək. Daha sənin yanına nəyə gəlim?” Mənsur bu dəfə yazdı: “Gəl bizə nəsihət ver”.

İmam (əleyhissəlam) cavabında yazdı: “Əgər bir nəfər dünya əhli olsa, sənə nəsihət etməz, Axirət əhli də olsa, sənin yanına gəlməz.”(٢)

### Qondarma müftilər

Bəni-Üməyyə xəlifələri çalışırdılar ki, müxtəlif yollarla camaatı məsum İmamların məktəbindən uzaqlaşdırıb onlarla İmamlar arasında ayrılıq salsınlar. Bu məqsədlə onlar camaatı hökumətdən asılı olan, ya da heç olmasa, hökumətə zərəri olmayan qazılara müraciət etməyə məcbur edirdilər.

Abbasi xəlifələrinin işin əvvəlində öz məqsədlərinə nail olmaları üçün Bəni-Haşimə tərəfdar olmağı özlərinə şüar etməsinə baxmayaraq, hakimiyyət başına gəldikdən sonra onlar da Bəni-Üməyyə xəlifələrinin gördükləri işləri görməyə başladılar.

Abbasi xəlifələri də Bəni-Üməyyə xəlifələri kimi mənəvi cazibə və ruhlandırıcı məktəbləri camaatı özünə vurğun etmiş İmamları öz hökumətləri üçün böyük təhlükə hesab edirdilər. Buna görə də, çalışırdılar ki, İmamları daima künc-bucaqda saxlasınlar. Bu məsələ İmam Sadiq əleyhissəlamın dövründə daha çox nəzərə çarpırdı. O Həzrətin dövründə xəlifələr açıq-aşkar çalışırdılar ki, bir müddət İmam Sadiq

əleyhissəlamın şagirdi olmuş şəxsləri onun məktəbinin müqabilində fətva kürsüsünə otuzdurub onu camaat üçün qazı, müfti təyin etsinlər. Belə ki, (bir vaxtlar İmam Sadiq əleyhissəlamın şagirdləri olmuş) İbn Əbu Zi`b və Malik ibn Ənəsi bu kürsüdə .otuzdurdular

Mənsur Dəvaniqi bu məqsədlə Malik ibn Ənəsə həddən artıq çox hörmət edir və onu rəsmi müfti və qazı kimi tanıtdırırdı. Bəni-Abbas xəlifələrinin carçısı Mədinə şəhərində gəzib elan edirdi ki, Malik ibn Ənəs və İbn Əbu Zibdən(۳) başqa İslami hökmlər barədə (fətva verməyə heç kəsin haqqı yoxdur.(۴

## Məcburi yazılmış kitab

Mənsur Dəvaniqi Malikə əmr edir ki, bir hədis kitabı yazıb hədisçilərin ixtiyarında qoysun. Malik bu işdən boyun qaçırır, lakin Mənsur israr edirdi. Bir gün Mənsur ona



---

.Biharül ənvar, c.۴۷, səh.۱۸۴ [۷۲] -۱

.Biharül ənvar, c.۴۷, səh.۱۸۴ [۷۳] -۲

Əbul Haris Məhəmməd ibn Əbdürrəhman ibn Əbu Zi`bin tərcümeyi-halı ilə tanış [۷۴] -۳ olmaq üçün “Vəfəyatül-ə`yan”ın təhqiq edilmiş çapının c. ۴, səh. ۳۶-ya; Əl-məarif, səh. .۴۸۵-ə müraciət edin

.Vəfəyatül-ə’yan, c.۴, səh.۱۳۵ [۷۵] -۴

deyir: “Bu kitabı yazmalısan, çünki indi səndən bilikli adam yoxdur.” Malik Mənsurun israr və təkidi nəticəsində “Müvəttə” adlı bir kitab yazır.(۱) Bu hadisədən sonra o dövrün hakim qüvvələri camaatı İmam Sadiq əleyhissəlamın məktəbindən uzaqlaşdırmaq üçün bütün qüvvəsi ilə Malikin səs-sorağını, verdiyi fətvaları yayıb təbliğ etməyə başlayırlar. Mənsur Malikə deyir: “Əgər sağ qalsam, sənin fətvalarını Quran ayələri kimi yazıb bütün şəhərlərə göndərərək camaatı ona əməl etməyə məcbur edəcəyəm.”(۲)

Əlbəttə, bu müftilər də öz dövrlərinin müqabilində istər-istəməz onların mənafeyini qoruyurdular. Əgər xəlifə bilsəydi ki, ona tabe olan müftilər onun mənafeyinə zidd olan bir iş görüb, yaxud öz aləmlərində onun mənafeyi ilə ziddirlər, onları möhkəmcə cəzalandırardı. Belə ki, Malik ibn Ənəs, Mənsurun nəzərində o qədər böyük olmasına baxmayaraq, Mənsurun sözünü onun əmisi oğlunun yanında danışdığına görə onun əmri ilə yetmiş zərbə şallaq vurulması əmrinə məhkum olunmuşdu. Bu, Malikin xəlifənin fikrinə və meylinə zidd fətva verməsinə görə olmuşdu.(۳)

### Zeyd ibn Əli ibn Hüseyn əleyhissəlamın qiyamı

Zeyd(۴) ibn Əli (əleyhissəlam) İmam Baqir əleyhissəlamın qardaşı, Peyğəmbər (səlləllahu əleyhi və alih) ailəsinin ən fəzilətli və yüksəkrütbəli şəxsiyyətlərindən biri, alim, zahid, təqvalı və şücaətli bir şəxs olmuş,(۵) Bəni-Üməyyənin hakimiyyəti dövründə yaşamışdır.

Zeyd Əməvi xəlifələrinin özbaşınalıq, zülm və haqsızlıqlarını görüb həddən artıq narahat olur, belə fikirləşirdi ki, silahlı mübarizə yolu ilə onların hakimiyyətini devirmək lazımdır.

### Zeydin Dəməşqə çağırılması

Zeydin qiyam fikrində olmasından xəbərdar olan Hişam ibn Əbdülməlik bu fikirdə idi ki, onu bir yolla aradan götürüb özünü onun təhlükəsindən qorusun. Hişam bu çirkin məqsədinə çatmaq üçün xəyanətkar bir plan hazırladı. Bu planın ardınca Zeydi Dəməşqə çağırtdırdı. Zeyd Dəməşqə gəlib Hişamla söhbət etmək üçün hökumət binasına getdikdə, Hişam əvvəlcə ona qarşı soyuq münasibət göstərdi və öz fikrinə

görə onun mövqeyini camaatın nəzərində aşağı salmaq üçün oturmağa ona yer göstərməyib dedi: Yusif ibn Əmr Səqəfi (İraq valisi) mənə xəbər verib ki, Xalid ibn .Vəlid(۶) sənə altı yüz min dirhəm pul verib, indi sən həmin pulları geri qaytarmalısan

.Xalid mənə heç bir şey verməyib —

Elə isə onda İraqa - Yusif ibn Əmr Səqəfinin yanına getməli və o səni Xalidlə — .üzləşdirməlidir

səh:۲۷

---

.Həyatül-İmam Musa ibn Cə'fər, c.۱, səh.۹۱ [۷۶] -۱

.Təzkirətül-hüffaz, c.۱, səh.۲۱۲ [۷۷] -۲

.Vəfəyatül-ə'yan, c.۴, səh.۱۳۷ [۷۸] -۳

Zeyd İmam Səccad əleyhissəlamın oğlu, imam Hüseyn əleyhissəlamın nəvəsi [۷۹] -۴ .olmuşdur

.Əl-Fəxri, səh.۱۳۲ [۸۰] -۵

Xalid ibn Əbdullah, Yusif ibn Əmr Səqəfidən qabaq İraq valisi olmuş, camaatın [۸۱] -۶ narazılığı səbəbindən Hişam onu işindən azad edərək həbs etmişdir. Ona vurulmuş ən əsas töhmət bu olmuşdur ki, guya o, Bəni-Haşimə tərəf meyl göstərir. Buna görə də, Zeydə atılmış böhtan bundan ibarət olur ki, guya Xalid beytül-maldan külli miqdarda .pul götürüb ona vermişdir

Məni Səqif qəbiləsindən olan alçaq bir şəxsin yanına göndərmə ki, mənə — .hörmətsizlik etsin

.Başqa çarə yoxdur, gərək gedəsən —

Hişam sonra əlavə edib deyir: Eşitmişəm ki, özünü xilafət məqamına layiq bilib xilafət kürsüsünə gəlmək fikrindəsən. Halbuki, sən bir kəniz oğlusan və kənizdən olan xilafət .başında otura bilməz

Zeyd deyir: Elə bilirsən ki, anamın bu mövqeyi (kəniz olması) mənim ləyaqətimi alçaldır? Məgər İshaq əleyhissəlamın azad qadından, İsmayıl əleyhissəlamın isə kənizdən olduğunu unutmusanmı? Buna baxmayaraq Allah-taala sonrakı Peyğəmbərləri Həzrət İsmayıl əleyhissəlamın nəslindən seçdi. İslam Peyğəmbəri ".Həzrət Məhəmməd (səlləllahu əleyhi və alih) də onun nəslindəndir

.Daha sonra Zeyd Hişama nəsihət verib onu təqvalı olmağa çağırdı

?Hişam dedi: Sənin kimi bir şəxs məni təqvalı olmağa dəvət edir

Zeyd: Bəli, əmr be-məruf və nəhy əz-münkər İslamın iki əsas hökmləridir və onu yerinə yetirmək hamının borcudur. Məqam və rütbəsinin aşağı olmasına görə kimsə bunları yerinə yetirməkdən boyun qaçıra bilməz, eləcə də, heç kəsin məqam və rütbəsinin yuxarı olmasına görə onları qəbul etməkdən boyun qaçırmasına haqqı .yoxdur

### Məcburi səfər

Hişam sərt söhbətindən sonra Zeydi İraqa göndərib Yusif ibn Əmrə bir məktub yazaraq bildirdi ki, Zeyd sənin yanına gəldikdə onu Xalidlə üzləşdir və ona Kufədə qalmağa bir saat da olsa, belə icazə vermə. Çünki o şirindil, xoşbəyan və natiq .adamdır, əgər orada qalarsa, Kufə camaatı tez bir zamanda onun tərəfinə keçər

Zeyd Kufəyə (İraqa) gircək Yusifin yanına gedib dedi: Nə üçün məni bura ?gətizdirmisən

.Yusif: Xalidin dediyinə görə o, sənə altı yüz min dirhəm pul vermişdir

.Xalidi çağırtdır, əgər bir sözü varsa, qoy üzümə desin —

Yusif əmr etdi ki, Xalidi zindandan gətirsinlər. Xalidi əl-ayağı ağır zəncirlərlə bağlanmış halda gətirdilər. Bu zaman Yusif üzünü ona tutub dedi: Bu Zeyd ibn Əlidir. İndi onda !nəyin varsa de

Xalid dedi: Allaha and olsun ki, onda mənim heç bir şeyim yoxdur, sizin onu bura .gətirməkdən məqsədiniz yalnız ona əzab-əziyyət verməkdir

Bu dəfə Yusif üzünü Zeydə tutb dedi: Əmirəl-möminin Hişam mənə əmr verib ki, elə bu .gün səni Kufədən çıxarım

.Zeyd: Üç gün mənə möhlət ver, qoy bir az dincəlim, sonra Kufədən çıxaram

.Yusif: Mümkün deyil, elə bu gün çıxmalısan

.Onda icazə ver təkcə bu gün qalım —

(Heç bir saat da mümkün deyil.(۱ —

Bu hadisənin ardınca Zeyd Yusifin göndərdiyi bir neçə məmurla birgə Kufədən çıxıb Mədinəyə tərəf hərəkət etdi. Kufədən bir az aralanan kimi məmurlar Zeydi tək qoyub ...geri döndülər



---

.Tarixi-Yə’qubi, c.۳, səh.۶۷-۶۸ ۱ -۱

## Kufədə

Zeydin Kufəyə gəlişi böyük səs-küy salmış, onun Hişamla söhbəti hər yerə yayılmışdı. Vəziyyətin gedişatını yaxından izləyən Kufə camaatı Zeydin Mədinəyə göndərilməsini eşitcək tez özlərini ona çatdırıb onu himayə edəcəklərini bildirərək dedilər: “Kufədə qal və camaatdan beyət al! Arxayın ol ki, yüz min nəfər sənə beyət edib sənin ordunda vuruşmağa hazır olacaq. Bəni-Üməyyənin isə Kufədə çox az tərəfdarı var, onlar da ilk ”.hücumda qırılıb qurtaracaqlar

Kufə camaatının Həzrət Əli (əleyhissəlam), İmam Həsən (əleyhissəlam) və eləcə də, İmam Hüseyn əleyhissəlamın dövründəki vəfasızlıqlarını yaddan çıxarmamış Zeyd bir o qədər də onların vədələrinə arxayın olmadı, ancaq kufəlilərin həddən artıq təkidləri nəticəsində Mədinəyə getmək fikrindən daşınıb Kufəyə qayıtdı. Camaat dəstə-dəstə gəlib ona beyət etdi. İş o yerə çatdı ki, təkcə Kufədən iyirmi beş min nəfər döyüşə .hazır oldu

## Böyük vuruşma

Yusif ibn Əmr Səqəfi Əməvilərə zidd olan qoşun dəstələrinin Zeydin ətrafına toplaşmasını ardıcıl olaraq Hişama xəbər verirdi. Bu işdən qorxuya düşən Hişam Yusifə .əmr edir ki, tez Zeydin topladığı orduya hücum edib qiyam alovunu söndürsün

Hər iki tərəfin qoşunları səfərbər oldu və çox çətin bir döyüş baş verdi. Zeyd son dərəcə şücaətlə vuruşur və ordusunu dözümlü olmağa çağırırdı. Döyüş axşamadək davam etdi. Birdən düşmən tərəfindən atılmış bir ox Zeydin alnına batır. Daha döyüşməyə taqəti qalmayan Zeyd bir tərəfdən bəzi dostlarının döyüşdə öldürülməsinə, digər tərəfdən də ordusunun bir hissəsinin pərakəndə olmasına görə .məcbur qalıb geri çəkilmək əmri verdi

## Zeydin şəhid olması

Oxu Zeydin alnından çıxartmaq üçün axşam bir həkim gətirdilər. Ancaq ox çox dərinliyə işlədiyindən onu asanlıqla çıxartmaq mümkün olmadı. Nəhayət, həkim oxu (Zeydin alnından çıxartdı, ancaq oxun yarası ciddi olduğundan Zeyd şəhid oldu.(١

Zeydin dostları uzun sürən məsləhətdən sonra belə qərara gəldilər ki, Hişamın adamları Zeydin cənazəsini tapa bilməsin deyə, onu dəfn etsinlər. Bu məqsədlə onlar əvvəlcə suyun axarını yenə əvvəlki vəziyyətinə qaytardılar. Təəssüflər olsun ki, məsələ heç də onlar istəyən kimi olmadı. Hişamın məmurlarından biri Zeydin dəfn mərasimində iştirak edərək bütün məsələni açıb Yusifə deyir. Yusifin göstərişi ilə Zeydin cənazəsini çıxarıb başını bədənindən ayırdılar və bədənini Kufənin girəcəyində dara çəkdilər. Onun başsız bədəni dörd ilə qədər darda qaldı. Sonra isə bədənini .dardan endirib od vurub yandırdılar və külünü sovurdular

### İmam Sadiq (ə) və qiyamlar

O dövrün tarixini araşdıranda belə bir sual qarşıya çıxır ki, ümumiyyətlə İmam Sadiqin (ə) o vaxt şiələr tərəfindən baş verən qiyamlara qarşı münasibəti necə idi? Görəsən ?onları müsbətmi qarşılayırdı? Əgər razı deyildisə, səbəbi nə idi

Ümumiyyətlə hər bir inqilabda, əsasən iki özəl hədəf güdülür: Birinci, nifrət qazanılmış mövcud hakimiyyəti yıxmaq. İkinci isə, yerində nəzərdə tutulan yeni, ideal hökumətin .təməlini qoymaq



---

.(Hicri qəməri tarixi ilə ۱۲۱-ci il səfər ayında (Məqatilut-Talibin, səh. ۱۳۹ [۸۲]-۱

Sualımızın cavabına gəldikdə isə əməvilər sülaləsinin son dövrlərindən tutmuş ta abbasilərin də dövranını nəzərdə tutmaqla belə qənaətə gəlirik ki, bu qiyamların əksəriyyəti mövcud hakimiyyətin əlindən cana doymuş xalqın kəskin e`tirazlarının alovlanmasının təzahürüdür. Hər zaman zülm həddini aşdıqda qiyamlar da ardınca şö`lələnirmiş. Zalım əməvi və abbasi sülalələrindən təngə gəlmiş məzlum xalq ədalət bayrağını qaldıracaq qəhrəmanın ardınca idilər ki, hər vaxt belə bir hadisə üz versəydi, dərhal ona qoşulurdular (adətən də belələrini seyyidlər və şiələrin böyük şəxsiyyətləri .(təşkil edirdi

Bu qiyamlar öz gücünü demək olar şiə məktəbinin ideologiyasından, onun radikal, cəsarətli və son dərəcə din-imanında qətiyyətli adamlarından alsa da, əməvi və ya abbasilərin hakimiyyətinin devrilməsindən sonra yeni, ideal bir hökumətin qurulmasına o qədər də zəmanət verilmirdi. Bunun səbəbini aşağıda verilən amillərdə :araşdırmalıyıq

Mə`lum olduğu kimi bu qiyamların rəhbərləri elə də düzgün, kamil bir proqram irəli .١ sürmürdülər və onların rəftar və ideyalarında çoxlu çatışmamazlıqlar müşahidə .olunurdu

İnqilabçı qüvvələr, adətən həm say həm də hərbi hazırlıq baxımından elə bir .٢ .səviyyədə deyildilər ki, qələbəyə ümid gözü ilə baxa bilinsin

Bu qüvvələrin arasında müxtəlif fikir və əqidəli qruplar iştirak edirdilər ki, bütünlüklə .٣ .sağlam, dindar və e`tibarlı adamların hökumət başına gəlməsinə tam ümid yox idi

Buna ən gözəl nümunə zülmkar abbasi sülaləsinin hakimiyyətə gəlməsini göstərə bilərik. Elə bu kitabda müşahidə etdiyiniz kimi Əhli-beytin (ə) mübariz tərəfdarlarının sayəsində cinayətkar əməvilər devrildikdən sonra dövləti ələ keçirən abbasilər sonralar zülmkarlıqda əməvilərin üzünü ağartdılar! Əgər imamlarımızın (ə) da bu qiyamlara müsbət münasibətini müşahidə etmiriksə, elə bu səbəblərə görədir və onlar o zamankı vəziyyəti çox gözəl analiz edirdilər. Şiənin böyük mütəfəkkirlərindən olan Məhəmməd Mehdi Şəmsəddin bu barədə belə yazır: “Risalətin davamçıları olan mə`sum imamlar çox yaxşı bilirdilər ki, bu qiyamlarda rəhbərliyə arxa olan qüvvələr sağlam inqilab ruhundan uzaqdır və onlarda sarsılmaz mübarizlik hissi yoxdur ki,

inqilabı geniş miqyasda son qələbəyə kimi davam etdirə bilsinlər. Beləliklə, belə qüvvələrə arxalanan hər bir hərəkat məğlubiyyətə məhkumdur və onun ağır zərbəsinin təkcə özlərinə yox, bütün İslam ümmətinə dəyəcəyini təsəvvür etmək çox da çətin deyildi. Həmçinin, imamlarımız bilirdilər ki, qələbənin səmərəsindən faydalananlar da əksəriyyət təşkil edən qeyri-şiə və qeyri-sağlam qüvvələr olacaqdır. Elə buna görə də onlara qoşulmur və onlarla qarşı-qarşıya da durmurdular."(١)

Yuxarıda qeyd olunanlar müxtəsər surətdə imamlarımızın şiələrin mübariz şəxsiyyətlərinin qaldırdıqları qiyamlara qarşı ümumi münasibətini açıqlayırdı. Amma Zeydin qiyamı haqda isə nisbətən geniş təhlilimiz olacaqdır.

### Zeydin qiyamında İmam Sadiq əleyhissəlamın razılığı olmuşdurmu?

Zeyd barədə, eləcə də, onun İmamət iddiasında olub-olmaması və İmam Baqir (əleyhissəlam) və İmam Sadiq əleyhissəlamın imamətini qəbul edib-etməməsi barədə məsum İmamlardan bir-birinə zidd olan müxtəlif rəvayətlər nəql edilmişdir. Bu rəvayətlərin bir qismində Zeyd tənqid olunaraq mənfi tip, digər bir qismində isə müsbət tip kimi göstərilmişdir.



---

١- [٨٣] Ənsarül Hüseyn, səh. ٢١٠.

Bizim hədis və rical(١) elmi sahəsindəki alim və təhqiqatçılarımız istər keçmişdəkilər, istərsə də müasirlər, Zeydi tənqid edib onu mənfi tip surətində göstərən hədisləri qəbul etməmiş və onlara arxalanmamışlar. Misal üçün qeyd etmək olar ki, mərhum ayətullah əl-uzma Xoyi Zeydin tənqidi barədə olan rəvayətləri araşdırıb onları qəbul olunmaz hesab etdikdən sonra bu rəvayətləri sənəd nöqteyi-nəzərindən zəif və etibarsız bilib yazır: “...Dediklərimizdən belə nəticəyə gəlirik ki, Zeyd böyük və təqdirəlayiq bir şəxsiyyət olmuş və onun əqidə pozğunluğu, yaxud tənqidi barədə əlimizdə heç bir qəti sübut yoxdur.”(٢)

Mərhum Əllamə Məclisi də Zeyd barədə olan rəvayətləri qeyd etdikdən sonra yazır: “Zeyd barədə rəvayətlər müxtəlifdir. Lakin onun tərifi və haqdan kənar iddialar etməməsi barədəki rəvayətlər üstünlük təşkil edir. Şiə alimlərinin əksəriyyəti onun məqamının uca olması haqda nəzər vermişlər. Buna görə də, yaxşı olar ki, onun barəsində xoş təəssüratda olub onu tənqid etməkdən çəkinək.”(٣)

Zeydin qiyamına gəlincə isə bir çox fakt və sübutlar göstərir ki, o, İmam Sadiq əleyhissəlamın razılığı ilə qiyam etmişdir. Bu faktlardan biri də, İmam Riza əleyhissəlamın Məmunun sualına verdiyi cavabıdır. İmam Riza (əleyhissəlam) Məmunun cavabında buyurur: “Atam Musa ibn Cəfər atası Cəfər ibn Məhəmməddən eşitmişdir ki, o (İmam Sadiq (əleyhissəlam)) buyurub: “...Zeyd qiyam etmək üçün mənimlə məsləhətləşdi. Mən ona dedim ki, əmi can, əgər Kufənin girəcəyindən asılacaq şəxs olmaq istəyirsənsə, sənin yolun elə budur.” Zeyd İmam Sadiq əleyhissəlamın hüzurundan getdikdən sonra o Həzrət buyurdu: “Vay o şəxsin halına ki, onun dəvət sədasını eşidə, lakin ona cavab verməyə!”(٤)

Bu rəvayət açıq-aşkar sübut edir ki, Zeydin qiyamı İmam Sadiq əleyhissəlamın razılığı ilə olmuşdur. Sadəcə olaraq ola bilərdi ki, İmam Sadiq əleyhissəlamın Zeydin qiyamına baş qoşub ona razılıq verməsi düşmənin sorağına çata, digər tərəfdən də Zeydin qiyamı ehtiyat və hesab-kitab üzündən olsun deyə, nə İmam Sadiq (əleyhissəlam) nə Zeydin özü nə də İmamın səhabələri bu işdən kimsənin xəbər tutmasını istəmirdilər.

İmam Sadiq (əleyhissəlam) Zeydin ordusunda vuruşaraq Əməvi qoşunlarından altı nəfəri öldürmüş bir şəxsə buyurur: “Allah məni bu qanlara şərik etsin. And olsun Allaha

ki, əmim Zeyd eynilə Həzrət Əli (əleyhissəlam) və onun səhabələrinin yolu ilə hərəkət etmişdir."(5)

Zeyd İmam Sadiq əleyhissəlamı imam kimi tanıyan şəxslərdən olmuşdur. Onun özü də demişdir ki, Cəfər (İmam Sadiq (əleyhissəlam)) halal və haram məsələsində bizim İmamımızdır.(6)

Zeyd həmçinin deyirdi: "Hər bir vaxt biz Əhli-beytdən bir nəfər Allahın hüccəti olmalıdır. Bizim dövrümüzün hüccəti də qardaşım oğlu Cəfər ibn Məhəmməd əleyhissəlamdır. Ona itaət edən şəxs əsla yolunu azmaz, onunla müxalifətçilik edən şəxs isə əsla düz yola yönəlməz."(7)



---

۱- [۸۴] Rical elmi hədisçilərdən bəhs edən elmdir.

۲- [۸۵] Mö'cəmu-ricalil-hədis, c.۷. səh.۳۴۵-۳۵۶.

۳- [۸۶] Biharül-ənvar, c.۳۶, səh.۳۰۵.

۴- [۸۷] Üyuni-əxbarir-Riza, c.۱, səh.۲۲۵.

۵- [۸۸] Qamusür-rical, c.۴, səh.۵۷۰.

۶- [۸۹] İxtiyari-mə'rifətir-rical, səh.۳۶۱.

۷- Əl-Əmali (Şeyx Səduq), səh.۳۲۵.

İmam Sadiq (əleyhissəlam) buyurardı: “Allah əmim Zeydə rəhmət eləsin! Əgər qalib gəlsəydi, mütləq (verdiyi vədə) əməl edərdi. Əmim Zeyd camaatı Ali-Məhəmməddən (səlləllahu əleyhi və alih) (Peyğəmbər ailəsindən) olan seçilmiş bir şəxsə itaət etməyə (dəvət edirdi. O şəxs də mənəm.”(١)

Başqa bir rəvayətdə İmam Sadiq (əleyhissəlam) Zeyd barədə buyurur: “Allah ona rəhmət eləsin, mömin, arif, bilikli və düzdanışan adam idi. Qalib gələrdisə, verdiyi vədə (əməl edər, hakimiyyəti ələ alsaydı, onu kimə verəcəyini yaxşı bilirdi.”(٢)

Zeyd və dostlarının şəhadət xəbəri Mədinə şəhərinə çox acınacaqlı təsir bağışladı. Bu hadisədən hamıdan çox İmam Sadiq (əleyhissəlam) kədərləndi. Bu hadisə İmam Sadiq əleyhissəlama o qədər təsir etmişdi ki, Kufə və Zeydin adı çəkiləndə ixtiyarsız olaraq o Həzrətin gözlərindən yaş axmağa başlayır, şəhid olmuş əmisi və onun dostları barədə təəssüflə dolu olan ürəkağrıdıcı sözlər deməklə onun şəhadətini dərin hörmətlə yad .edirdi

İmam Sadiq əleyhissəlamın Həmzə ibn Həmran adlı bir dostu deyir: “Bir gün İmam Sadiq əleyhissəlamın yanına getdikdə, o Həzrət məndən soruşdu: “Həmzə, haradan gəlirsən?” Dedim ki, Kufədən gəlirəm. İmam Sadiq (əleyhissəlam) Kufənin adını eşitcək bərk ağlamaq tutdu, belə ki, mübarək sifəti göz yaşlarından islandı. Bu vəziyyəti belə görüb təəccüblə soruşdum: “Ey Peyğəmbərin övladı! Sizin bu cür ağlamağınıza səbəb ”?nə oldu

İmam Sadiq (əleyhissəlam) qəmli və gözləri yaşla dolmuş halda buyurdu: “Əmim Zeyd və başına gətirilənlər yadıma düşdü, ona görə də ağladım.” Bir daha soruşdum: “Onun ”?haqqında məgər sizin yadınıza nə düşdü

”.İmam Sadiq (əleyhissəlam) buyurdu: “Onun şəhadəti yadıma düşdü

.Sonra Həzrət (ə) Zeydin qiyam və şəhadətini Həmzəyə olduğu kimi başa saldı

**Məhəmməd “Nəfsİ Zəkərİyyə”nin İnqilabı .١**

(٣)

İmam Sadiqin (ə) ömrünün son dövrlərinə təsadüf edən çox mühüm hadisələrdən biri də Abbasilərin ikinci xəlifəsi Mənsur Dəvaniqinin əleyhinə qaldırılmış Məhəmməd Nəfsi Zəkiyənin qiyamıdır. Şiələrin rəhbər və imamı kimi Həzrətin bu hadisəyə münasibəti .olduqca əhəmiyyətli idi

Məhəmməd özü ata tərəfdən İmam Həsənin dördüncü nəslindən olub ana tərəfdən isə İmam Hüseynə (ə) gedib yetişirdi. Bu insan çox alicənab, pərhizkar və pak təbiətinə, ələlxüsus yüksək daxili-mə`nəvi keyfiyyətlərinə görə "Nəfsi Zəkiyyə" (mə`nən saf, təbiətcə pak) ləqəbilə tanınmışdır.(۴) O, Bəni Haşimin ən görkəmli və fəzilət sahiblərindən olub dindarlıqda, elm və siyasətdə, alicənablıq, bəxşiş və (şücaətdə parlaq bir şəxs idi.(۵

Pak və ülvi nübuvvət xanədanına mənsub, eləcə də risalət məktəbinin yetirməsi olan Məhəmməd müqəddəs İslam adı altında müsəlmanların müqəddəratına hakim kəsilmiş tağut rejimini qəbul edə bilməzdi. Elə buna görə də Əməvilər sülaləsinin son dövrlərindən başlayaraq onu devirmək üçün mübarizəyə qalxmış və bu məqsəd .uğrunda ona qoşulmuş bir çox tərəfdar və cəsur adamlarla əhd-peyman bağlamışdı



---

.Qamusur-rical, c.۴, səh.۵۶۶ [۹۱] -۱

.İxtiyari-mə'rifətir-rical, səh.۲۸۵ [۹۲] -۲

.Məhəmməd ibn Abdullah ibn Həsən ibn Həsən (ə) ibn Əli (ə) ibn Əbu-Talib [۹۴] -۳

.Mürucuz-zəhəb, c. ۲, səh. ۲۹۴; Əl-əxbarüt-tival, səh. ۳۸۵ [۹۵] -۴

.Əl-fəxri, ۱۸۵ [۹۶] -۵

Yeri gəlmişkən onunla o zaman bey`ət edənlərdən biri də Əbu Cə`fər Mənsur Dəvaniqi olmuş(۱) və sonra qeyd edəcəyimiz kimi xilafətə gədikdən sonra Məhəmmədin qətlinə də o fərman vermişdi. Əlbəttə, onun bu hərəkata qoşulması və bey`əti bir sıra məqsədlərə görə olmuşdur. Çünki elm, dərrakə və siyasətdə ad qazanmış Məhəmməd kimi nüfuzlu bir şəxsin kənarında Mənsur və onun kimiləri kölgədə görünürdü.

### Qiyamın başlanğıcı

Əməvilərin süqutundan sonra iqtidarı ələ keçirmiş Əbul Abbas Səffahın xilafətini rəsmi olaraq tanımayan Məhəmməd və qardaşı İbrahim məcbur olub bir güşədə gizləndilər. Məhəmməd, onun xilafəti qəsb etdiyini bildirərək bu mənsəbə özünün layiq olduğunu söyləyirdi. Deyirdi ki, o vaxt bey`ət və əhd-peymana əsasən indi Əbul Abbas və qardaşı Mənsur ona tabe olmalıdırlar, əksinə yox. Onların bu müxalifəti Əbul Abbası bərk təşvişə salmışdı və hətta onların yerini öyrənmək üçün atası ilə də sorğu-sual aparmışdı. Onu lap çox qorxudan məsələlərdən biri də Məhəmmədin böyük şəxsiyyətlərdən birinin qiyama də`vəti məktubunun onun əlinə düşməsi idi.(۲)

Beləliklə bu mübariz iki qardaş gizli surətdə hökumətin əleyhinə qiyama hazırlaşaraq öz ətrafına inqilabçı adamları toplamağa başladılar.(۳) Hicrətin ۱۳۶-cı ilində (Əbul Abbasın xilafətinin sonlarında) Mədinəyə gəlmiş vəliəhd Mənsurun görüşündə çoxları, o cümlədən Bəni Haşim də iştirak etsə də, bu iki qardaş görüşdən imtina etdilər.(۴)

Mənsur xilafətə gəldikdən sonra onların axtarışı üçün ciddi tədbirlərə əl atdı. Onların yerini tapmaq üçün, demək olar bütün şiələr sorğu-suala çəkilirdi.(۵) Bütün bunların bir nətəcəsi olmadıqda çoxlu casusları küllü miqdarda pul və miniklə tə`min etməklə bu işə cəlb etdi.(۶) ۱۳۸-ci ildə Fəzl ibn Salehi həcc mərasiminin əmiri tə`yin edib ona ciddi tapşırdı ki, Məhəmməd və İbrahimi harada mümkün oldu ələ keçirib ona təhvil versin.

Fəzl Mədinəyə daxil olduqdan sonra bütün camaat və eləcə Həsəni seyidləri onun görüşünə gəlmişdilər. Fəzl, Məhəmməd və İbrahimin onun hüzuruna gəlmədiyini görüb atası Abdullahdan onların harda olduğunu soruşduqda ona bəhanə gətirərək demişdi ki, istirahət üçün ova çıxıblar.(۷)

Zaman ötdükcə qarşıya başqa mühüm məsələlər və hadisələr çıxırdı ki, Mənsur da çarəsiz qalıb bütün gücünü onların həllinə sərf edirdi. Nisbətən yaddan çıxmış Məhəmməd isə ələ düşən fürsəti qətimət bilib öz ideyalarını yaymağa və ətrafına adam toplamaq üçün müxtəlif məntəqələrə nümayəndələr göndərməyə başladı.(٨) Hadisələri ardıcıl yoluna qoyan Mənsur yenidən ehtimal verilən bu hərəkatın qabağını almaq üçün bütün qüvvələri Hicazın başdan-başa nəzarətdə saxlamasına yönəltdi. Çünki bu müddət ərzində Hicazda Məhəmmədin hərəkatının yayılmasına dair yeni-(yeni xəbərlər ona gəlib çatırdı.(٩



---

١- [٩٧] ١٧٣-١٩٧ .Məqatilut-talibin, səh

٢- [٩٨] ١١٨-١٢٠, ١٥٨ .Məqatilut-talibin, səh

٣- [٩٩] ١٨٠ .Tarixül-ümməm vəl-muluk, c. ٩, səh

٤- [١٠٠] ٥١٣ .Əl-kamilu fit-tarix, c. ٥, səh

٥- [١٠١] ١٨١ .Tarixül-ümməm vəl-muluk, c. ٩, səh

٦- [١٠٢] ١٨١ .Tarixül-ümməm vəl-muluk, c. ٩, səh

٧- [١٠٣] ١٨١ .Tarixül-ümməm vəl-muluk, c. ٩, səh

٨- [١٠٤] ٥١٧-٥٢٢ .Əl-kamilu fit-tarix, c. ٥, səh

٩- [١٠٥] ١١٥ .Cihaduş-şiə, Doktor Səmirə Muxtarül-leysi, səh

### Artıq təzyiqlər

cı ildə həcc mövsümünü bəhanə edən Mənsur, Məhəmmədin işinə birdəfəlik son-۲۴۰ qoymaq üçün yolunu Mədinədən saldı. O, bu səfərilə, demək olar bu hərəkatın mərkəzi olan Mədinəni, o cümlədən bu oyanışları iflic etmək istəyirdi. Mədinəyə daxil olduqdan sonra şiələrin tanınmış şəxsiyyətləri ilə bir sıra görüşlər keçirdi, onlara ən`am və hədiyyələr təqdim etdi. Bə`zilərinə pul təklif etməklə tamahlandırmaq, digərlərinə isə hədə-qorxu gəlməklə Məhəmmədin yerini öyrənməyə cəhd göstərdi. O cümlədən Məhəmmədin də atasını çağırtdırıb oğullarının yerini deməyə vadar etsə də, atasının onlardan xəbərsiz olduğunu eşitdi. Onların arasında gedən danışıq sərtləşdiyi vaxt atası dedi: "Əgər Məhəmməd ayağımın altında belə gizlənmiş olsa ayağımı qaldırmaram ki, onu görmək sənə nəsib olsun!" Bu sözlərdən bərk qəzəblənən Mənsur (onu və ailəsindən neçə üzvünü zindana saldırdı və Abdullah üç il zindanda qaldı.(۱

### Silahlı qiyam və onun sonu

Mənsurun bu hərəkatı yatırmaq üçün bütün cəhdləri, demək olar nəticəsiz qaldı. Məhəmməd özü Mədinənin ətrafında gizlənsə də onun tərəfdarlarının sayı günbəgün .artır, artıq şəhər inqilabın mərkəzinə çevrilirdi

Nəhayət, bu hərəkatı inqilaba sövq edən neçə illik mübarizədən sonra ۱۴۵-ci ilin rəcəb ayında Mədinəyə daxil olub kütləvi bey`ət topladıqdan sonra şəhərin idarəsini öz ixtiyarına aldı. Halbuki son qələbə üçün lazımı tədarük görülməmiş və onun müxtəlif məntəqələrə yolladığı nümayəndələr də işi tam başa çatdıra bilməmişdilər. Bu minvalla şəhər zindanının qapılarını sındırıb məhbusları azad etməklə silahlı qiyamın .ilkin təməlini qoydular

Mənsur xəbərdar olan kimi cəld qardaşı İsanın başçılığı ilə Mədinəyə qoşun göndərdi. Çox qızğın və qanlı döyüşdən, həmçinin qiyamçıların sarsılmaz fədakarlıq və rəşadətindən sonra Mədinə şəhəri süqut etdi və qiyam yatızdırıldı. Bu döyüşdə çoxları qırıldı, o cümlədən Məhəmməd və yaxın silahdaşları qətlə yetirildi.(۲) Bu məğlubiyyətdən sonra elə həmin il qardaşı İbrahim Bəsrədə qiyam etdi. Bu qiyamda da İbrahim məğlub olaraq öldürüldü.(۳) Tarixdə çox mühüm olan Məhəmmədin inqilabının siyasi, ictimai, hərbi və təchizati kimi müxtəlif məxlubolma səbəbləri

(olmuşdur ki, burada təfsilatı ilə açıqlamağa imkan yoxdur.(۴

**İmam Sadiqin (ə) Məhəmməd "Nəfsi Zəkiyyə"nin inqilabına münasibəti**

Ötən bəhslərdə dediyimiz kimi bu qiyamların müasiri olmuş İmamlarımızın yekdil münasibəti təxminən Məhəmmədin inqilabına da aiddir. Çünki bu qiyamın özü də digər silsilə qiyamların motivində qərar tuturdu və təbii olaraq İmam Sadiqin (ə) mövqeyi digər imamlardan fərqlənə bilməzdi. Burada mə`lum olduğu kimi Həzrət onun hərəkatı ilə razılaşmamışdır. Çünki Məhəmməd "Nəfsi Zəkiyyə" məhdəviyyət ideyasını qaldıraraq hərəkatını ona əsaslandırırdı. Onun tərəfdarları, eləcə də atası bu əqidə və ideyanı geniş



---

۱- [۱۰۶] Tarixül-ümməm vəl-muluk, c. ۹, səh. ۱۸۳-۱۸۴; Tarixi Yaqubi, c. ۳, səh. ۱۰۹-۱۱۰; Əl-fəxri, səh. ۱۶۵; Məqatilut-talibin, səh. ۱۴۶.

۲- [۱۰۷] Məqatilut-talibin, səh. ۱۸۴-۱۸۵; Tarixi Yaqubi, c. ۳, səh. ۱۴۵; Mürucuz-zəhəb, c. ۳, səh ۲۹۴.

۳- [۱۰۸] Məqatilut-talibin, səh. ۲۱۰.

۴- [۱۰۹] Məqatilut-talibin, səh. ۲۱۰-dan sonrakı hadisələr; Cihadüş-şiə, səh. ۱۶۶.

surətdə təbliğ və tərvic edərək o günün ictimai kütləsi arasında təsəvvür olunmayan bir inam yaratmışdılar.(1) Bu elə bir məsələ deyildi ki, İmam Sadiq (ə) onun kənarından asanlıqla sovuşsun.

Bu hərəkatın başlanğıcı əməvilərin hökmranlığının son dövrlərinə təsadüf edir. Ələvilər (Əhli-beyt (ə) tərəfdarları) və Abbasilərdən təşkil olunmuş bir yığıncaqda Məhəmməd Nəfsi Zəkiyyə inqilabın rəhbəri tə`yin olunur və orada iştirak edənlərin haması onunla bey`ət edirlər. Bu yığıncaqda Abdullah Məhz, iki oğlu Məhəmməd Nəfsi Zəkiyyə və İbrahim, əbu Cə`fər Mənsur, Saleh ibn Əli, Məhəmməd ibn Əbdül Birr (Osmanın üçüncü nəslindən) kimi şəxslər var idi. "Əbva"da təşkil olunmuş bu yığıncağa həsəni seyidlərinin ağsaqqalı və o dövrün tanınmış şəxslərindən Nəfsi Zəkiyyənin atası Abdullah tərəfindən İmam Sadiq (ə) da çağırılmışdı.

Həzrətin gəlişindən sonra Məhəmməd yığıncağın təşkil olunma səbəbi və onun hədəfini açıqladı. İmam Sadiq (ə) buyurdu: "Bu fikirdən daşının, qiyamın vaxtı hələ yetişməyib." Sonra üzünü atası Abdullaha tutub dedi: "Elə güman edirsən ki, oğlun Məhdidir? Mən deyirəm ki, yanılırsan və bu zaman onun qiyamının vaxtı deyildir. Amma əgər alovlanıb Allaha xatir, əmr be mə`ruf və nəhy əz münkər etmək üçün onu qiyam və inqilaba qaldırırsansa, Allaha and olsun, ağsaqqal və ağamız olduğun halda səni tək qoymarıq və oğlun ilə də bey`ət edərik." Abdullah isə Həzrətin sözlərindən narahat olub onu paxıllıq üzündən söylədiyini güman etdi.(2)

Həqiqətdə isə İmam Sadiq (ə) imamət məqamından çıxış edərək çox gözəl bilirdi ki, Məhəmməd qələbə çala bilməyəcək və elə həmin yığıncağın sonunda atası Abdullaha buyurdu: "Oğlun xilafətə çatmayacaq və bunu da bil ki, "sarı qəbalı"dan (Mənsur Dəvaniqiyə işarə edərək) başqa da heç kimə nəsib olmayacaq."(3) Əbulfərəc İsfahani yazır ki, Abdullah imamın sözündən sonra əlini Əbul Abbasın çiyninə vurub dedi: "Bu, qardaşları və onların övladları xilafətə çatacaqlar, siz yox!" İmam isə əlini Abdullahın çiyninə vurub dedi: "Hökumət nə sənə nə də oğullarına nəsib olmayacaq. Bunlardır ki, xilafətə çatacaqlar və oğulların da qətlə yetiriləcəkdir."(4)

Deməliyik ki, elə İmam Sadiqin (ə) bu sözü deməyindən çox da keçməmiş Həzrətin əvvəlcədən olacaq hadisənin nəticəsinin ifşa etməsi xəbəri Mədinədə dolaşırdı.

Bununla maraqlananlar Həzrətin hüzuruna gəlib bu xəbəri onun özündən eşitmək istəyirdilər. Elə öz bacısı qızı Ümmül Həsən ondan belə bir xəbərin söylədiyini soruşduqda Həzrət demişdi: "Məhəmməd "rum evi"nin(۵) kənarında öldürüləcək, qardaşı İbrahim isə İraqda elə bir halda qətlə yetiriləcəkdir ki, mindiyi atın ayaqları (suyun içində olacaqdır."(۶

İmam Sadiq (ə) yuxarıda qeyd olunan səbəblərə görə Məhəmmədin hərəkatını qəbul etməsə də, lakin onun əleyhinə də heç bir ciddi e`tiraz münasibəti bildirmədi. Hətta Əbulfərəc İsfahaninin yazdığına görə oğulları Musa və Abdullahı Məhəmmədin



---

۱- [۱۱۰] Məqatilut-talibin, səh. ۱۴۰-۱۴۲, ۱۵۷-۱۵۸, ۱۶۰-۱۶۵; Əl-fəxri, səh. ۱۶۵-۱۶۶. Hətta Mənsur Dəvaniqinin özü məhdəviyyət ideyasından olduqca nüfuz qazanan Məhəmməd Nəfsi Zəkiyyəni nüfuzdan salmaq üçün öz oğlunun adını Məhəmməd qoyaraq onu Məhdi ləqəbləndirməklə iddia elədi ki, zühur edəcək Məhdi onun oğludur (Məqatilut-talibin, səh. ۱۶۲). Beləcə fürsəti qənimət bilən abbasilərdən biri Peyğəmbər (s)-in adından saxta bir hədis düzəldib dedi: Peyğəmbər buyurub ki, Məhdi əmim Abbasın nəslindəndir (Tarixül-xüləfa, Siyuti, səh. ۲۷۲).

۲- [۱۱۱] Məqatilut-talibin, səh. ۱۴۰-۱۴۱.

۳- [۱۱۲] Əl-fəxri, səh.۱۶۵.

۴- [۱۱۳] Məqatilut-talibin, səh. ۱۴۱-۱۴۲, ۱۷۲.

۵- [۱۱۴] Mədinədə məhəllə adı.

۶- [۱۱۵] Məqatilut-talibin, səh. ۱۶۸.

köməyinə göndərdi(١) və onlar bu hərəkatda Məhəmmədin kənarında idilər.(٢) Hələ qiyamın məğlubiyyətindən sonra Məhəmmədin yaxın silahdaşlarından olan Hüseyn ibn Zeydə (şəhid) pənah verərək amanda saxladı.(٣) Mə`lumdur ki, bu iki mühüm .addım xəlifə Mənsuru narahat etməyə bilməzdi

Burada diqqəti cəlb edən məsələlərdən biri də odur ki, İmamın bu hərəkata qoşulmaması heç də onun abbasilərlə razılaşmağından irəli gəlmirdi. Mövcud hakimiyyət də Həzrətin nəzərində qanunsuz və dindən uzaq sayılırdı. Hətta Mənsur Həzrəti dəfələrlə paytaxta öz sarayına çağırtdırıb onu müxtəlif əzab-əziyyətə salmaqdan əlavə qətlə yetirmək fikrinə də düşmüşdü. Lakin Allahın lütfü ilə hər dəfə o, bu sui-qəsdlərdən salamat qurtarmışdı.(۴) Elə Məhəmmədin hərəkata başladığı zamandan İmam (ə) Mənsur tərəfindən bir sıra çətinliklər və zərbələr görmüşdü. :Burada bir neçə nümunəni qeyd edirik

Bu hərəkatın gün-gündən gücləndiyi vaxt bir dəfə Mənsur özü onu yatırmaq qəsdi ilə Mədinəyə doğru hərəkət etdi. Özünü şəhərin yaxınlığınadək yetirib “Rəbəzə”də düşərgə saldı.(۵) Orada qaldığı müddət ərzində İmam Sadiq (ə)-ı hüzuruna çağırtdırıb Həzrətlə olduqca kobud rəftar edərək onu çox pis təhqir etmişdi.(۶) Yaxud hicrətin ۱۴۵-ci ili Məhəmmədin ilk dəfə qiyama başladığı gecə Mədinənin hakimi Bəni Haşimin böyük şəxsiyyətlərilə bərabər İmamı da həbs etdirmişdi.(٧) İmam Sadiq (ə) özü bu haqda deyir: “Məhəmmədin məğlubiyyətindən sonra məni Mənsurun hüzuruna apardılar. O, məni çox kobud ifadələrlə təhqir edərək qarşıladı. Ardınca dedi: Adını Nəfsi Zəkiyyə qoyduğunuz Məhəmməd ibn Abdullahın başına gələnlərdən xəbərim var. İndi intizarındayam ki, sizdən biri başını qaldıran zaman böyük və kiçiyinizə rəhm (etməyim.(٨

Məhəmmədin üzərinə göndərilmiş qoşunun sərkərdəsi İsa döyüşdən sonra mənim “eyn Əbu Ziyad” adlı torpaq sahəmi müsadirə etdi. Mənsurun hüzurunda ikən ona dedim ki, mənim torpaq sahəmi özümə qaytar, çünki gəlirim oradan tə`min olunur. (Mənə dedi: Hələ danışmağa üzün də var? Mən istəyirəm sənin canını alım!”(٩

Mənsur hətta bunlarla da kifayətlənməyib bir dəfə Mədinədə Həzrətin evini belə yandırtdırmışdı. Allahın lütfü ilə od-aluvun içindən özünü salamat qurtaran İmam

(Sadiq (ə) o vaxt demişdi: “Mən İbrahim Xəlilullahın övladıyam!”(۱۰



---

۱- [۱۱۶] Məqatilut-talibin, səh. ۱۷۰.

۲- [۱۱۷] Məqatilut-talibin, səh. ۱۸۶.

۳- [۱۱۸] Məqatilut-talibin, səh. ۲۵۷.

۴- [۱۱۹] Biharul-ənvar, c. ۴۷, səh. ۱۶۲, ۲۱۲.

۵- [۱۲۰] Əl-kamilu fit-tarix, c. ۵, səh. ۵۲۴.

۶- [۱۲۱] Məqatilut-talibin, səh. ۱۷۰; Biharul-ənvar, c. ۴۷, səh. ۱۹۲.

۷- [۱۲۲] Əl-kamilu fit-tarix, c. ۵, səh. ۵۳۰.

۸- [۱۲۳] Biharul-ənvar, c. ۴۷, səh. ۲۰۶; Nurul-əbsar, səh. ۱۴۷.

۹- [۱۲۴] Məqatilut-talibin, səh. ۱۸۴.

۱۰- [۱۲۵] Üsuli-kafi, c. ۱, səh. ۴۷۳.

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər sürəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik


:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹